

Tofiq Yusif (Hüseynov Tofiq Yusif oğlu) 1950-ci ildə anadan olub.

«Bir taleyin göynəmləri», «Tərtər şəhidləri», «Tərtər inciləri», «Qan iyi» və «Ömrümün payızı» kitablarının müəllifidir.

Azərbaycan Yazıçıları Birliyinin, Azərbaycan Mətbuat Şurasının və Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür.

«Qızıl Qələm» və «Məmməd Araz» mükafatları laureatıdır.

***Tərtər rayonu bizim hamımız üçün, Azərbaycan üçün çox əziz, doğma rayondur. Müharibə illərində tərtərlilər çox cəsarətlə vuruşmuşlar, öz doğma torpaqlarını müdafiə etmişlər. Buna görə də onlar hər cür minnətdarlıq və təşəkkürə layiqdirlər.***

***İlham Əliyev,***
***Azərbaycan Respublikasının Prezidenti***

**Tofiq Yusif**

# Ölümlə üz-üzə

*Redaktoru və ön sözün müəllifi:* **Solmaz Kazımova**

# Tofiq Yusif
## Ölümlə üz-üzə

Çayır kimi dünyanın hər yerinə səpələnmiş, yurd-yuvaları və əsli-kökləri bilinməyən köçəri ermənilər tarix boyu harada məskunlaşıblar-sa, oranı qan çanağına döndəriblər. Düzdür, nəticə etibari ilə bu qan çanağı həmişə onların öz başlarında çatlayıb. Lakin bəşər övladının ölümünə və əzabına olan hərisliklərı ətyeyən vəhşilərin öz ovlarını parçalamaq hərisliyindən qat-qat çox olan bu nankorlar hələ də öz murdar xislətlərindən əl çəkmirlər.

İstedadlı qələm sahibi Tofiq Yusifin «Ölümlə üz-üzə» adlandırdığı bu kitabında həmin hadisələrdən konkret danışılmasa da, Qarabağ savaşında şəhid olan igid oğullarımızdan 5 nəfəri, həmçinin yaralanmış tərtərli döyüşçülərdən bəziləri haqqında biblioqrafik məlumatlar və erməni vandalizminə, erməni qəddarlığına həsr olunmuş «Vəhşilər» poeması verilmişdir.



## Ön söz

***Hörmətli oxucu!***

«Ölümlə üz-üzə» adlı bu kitab istedadlı qələm sahibi Tofiq Yusifin altıncı, xalqımızın bəşəri faciəsi olan Qarabağ savaşına, bu savaşda doğma torpağı və milləti uğrunda həyatlarını və sağlamlıqlarını qurban vermiş qarabağlı – tərtərli igidlərə həsr etdiyi üçüncü kitabıdır.

1993-cü ildə çapdan çıxmış «Tərtər şəhidləri» kitabından fərqli olaraq, «Qan iyi» kitabında hal-hazırda yaşayan, lakin əlil olmuş döyüşçülərin xatirələrinə xeyli yer ayırmış müəllif bu kitabında da şəhid olmuş 5 ərən igidimizdən və bəzi sağ qalmış döyüşçülərdən söz açır.

Təqdirəlayiq haldır ki, müəllif təkrar-təkrar müharibə mövzusuna qayıdır və torpağımızın hər qarışı uğrunda canından-qanından keçmiş oğulların unudulmaması üçün əlindən gələni əsirgəmir.

Mənim fikrimcə, o dövrdəki dözülməz şəraitə baxmayaraq, müharibənin ilk günlərindən ov tüfənglərilə silahlanıb düşmənə qarşı mübarizə aparan oğullardan nə qədər yazılsa, yenə də azdır. Çünki, Qarabağ müharibəsindən, erməni məkrindən, erməni vəhşiliyindən, xalqımızın başına gətirilən müsibətlərdən cild-cild kitablar yazılmalıdır, filmlər çəkilməlidir. Ən azı ona görə ki, biz Xocalı faciəsini yaşamışıq – tarixlərdə görünməmiş, yaşanmamış bir faciə, bəşərə görk olası bir faciə. Ona görə ki, bu gün bizim düşmən tapdağında olan Şuşamız, Laçınımız, Kəlbəcərimiz, Qubadlımız, Cəbrayılımız, Zəngilanımız, Füzulimiz, Ağdamımız var. Hər birinin itirilməsi minlərlə ailənin faciəsidir, qeyrətli igidlərimizin şəhid olmasıdır. Ona görə ki, bu gün minlərlə qaçqınımız, köçkünümüz var, vəhşi, murdar ermənilərin əlində hələ də əsir olan qadınlarımız, qızlarımız var. Bir də ona görə ki, bizim bu müharibədə ağlasığmaz igidliklər göstərmiş, düşmənə qənim kəsilən oğullarımız olub və yenə var.

Əgər biz xalqımızın yaşadığı saysız-hesabsız faciələri, müharibələrin törətdiyi fəlakətləri və bu xalq, bu torpaq uğrunda

qan töküb canından keçən oğulları nə zamansa unutsaq, onda bir millət kimi yaşamağa, var olmağa sadəcə haqqımız yoxdur.

Biz müharibəni hələlik uduzsaq da, bu məğlubiyyəti yalnız döyüşçülərimizin adına yazmaq, ən azı, insafsızlıq olardı. Axı bizim Vəzir Orucov, Elman Hüseynov, Mehrac Mahmudov, Ədalət Paşayev, Əlyar Orucov və adlarını çəkmədiyim yüzlərlə igid, qəhrəman oğullarımız olub. Hər birisi bir orduya qarşı vuruşa biləcək qədər cəsarətli, qorxmaz, hünərli. Şərəfli ölümü şərəfsiz yaşamaqdan üstün tutan bu vətən övladları yurdumuzun müstəqilliyi, azadlığı uğrunda, bu gün bizlərin əmin-amanlığı yolunda öz canlarını qurban verdilər. Ürəyində, qəlbində vətən qeyrəti daşıyan, xalqının, millətinin təəssübünü çəkən bu oğulların hər biri ən yüksək hörmətə layiqdir. Tutduqları mövqedən, daşıdıqları rütbədən, döyüşdükləri müddətdən asılı olmayaraq hər biri qəhrəmandır. Lakin, bu igidlərin sırasında elə oğullar var ki, onların adları xüsusi çəkilməlidir, onlardan ayrıca söhbət açılmalıdır.

Bu məqamda ilk olaraq gözümün önünə Vəzir Orucov gəlir. Hər kəsin qəlbində özünə yer tapan, ilk tərtərli Milli Qəhrəmanımız, Tərtər – Ağdərə əməliyyatlarında aparıcı qüvvə olan Vəzir. Təsadüfi deyil ki, bu gün sağ qalan bütün döyüşçülər cəbhə xatirələrini Vəzirlə başlayır, Vəzirlə də qurtarırlar.

Vəzir Orucov hələ sağlığında qəhrəman kimi məşhurlaşmışdı. Ortaboylu, xoş simalı, çox sadə, heç bir hərbi təhsili olmayan bu oğlana böyük şöhrət qazandıran onun qeyri-adi, mən deyərdim ki, fitri hərbi bacarığı, ölümdən qorxmazlığı, hədsiz cəsurluğu, fədakarlığı, ən çətin anlarda risk etmək qabiliyyəti və bu kimi digər xüsusiyyətləri idi. O dəfələrlə yaralanmışdı, lakin çox vaxt inadkarlıq göstərib ön cəbhəni tərk etməmişdi. Vəzirin elə bu cəhətləri idi onu «canlı əfsanəyə» çevirən.

Ən çətin məqamlarda, çıxılmaz vəziyyətlərdə Vəzir mütləq bir çıxış yolu tapırdı. Bütün döyüşçülərdə belə bir inam var idi ki, Vəzir savaşdadırsa, sağdırsa demək qələbə bizimlədir. Bu inamı o özü qazanmışdı, özü də müharibənin ilk günlərindən.

Vəzir Orucovun qəhrəmanlıqları haqqında müharibə dövrünün mətbuatı saysız-hesabsız yazılar dərc edirdi. Onun ölümündən iki ay sonra işıq üzü görmüş bir kitabda verilmiş döyüş epizodlarından biri məni heyrətə saldı. Düşündüm ki, bu oğlanın ürəyi özündən də böyük imiş. Həmin yazını olduğu kimi sizə çatdırıram:



«Avqustun 18-də torpaqlarımızın işğalçılardan təmizlənməsi uğrunda döyüşlər artıq Çıldıran kəndinin yaxınlığında cərəyan edirdi. Həmin günlər Ağdərə əməliyyatının bəlkə də ən qızğın, ən dəhşətli döyüşləri gedirdi. Düşmənin atəş nöqtələrindən birini susdurmaq heç cür mümkün olmurdu. Daha yüksək mövqedə qərar tutan quldurlar əsgərlərimizin hərəkət istiqamətini asanlıqla müəyyənləşdirir, hər bir həmləsini asanlıqla dəf edirdi. Belə yeknəsəq taktika ilə nə döyüşün, nə də itkilərimizin sonu görünürdü. Vəziyyətin mürəkkəbləşdiyini əsl hərbçi səriştəsi ilə başa düşən Vəzir atəşin dayandırılması əmrini verdi.

– Güllələri havayı işlətməyin. İndi irəli getmək artıq qurban verməkdir. İşarəmi gözləyin, – deyib, dörd qumbara və avtomatını götürdü, düşmənin möhkəmləndiyi səngərlərin arxasına keçdi. Həmin an hamımızı dəhşət və heyrət bürüdü. Vəzirin fikri məlum idi, düşmənin arxasına keçib qəfil hücumla onları karıxdırmaq və döyüşçülərimizin irəliləməsinə imkan yaratmaq. Lakin bu planın təkbaşına alınacağı heç cür ağlasığan deyildi. Sonradan Vəzir bu hərəkətini belə izah etdi:

– Riskə getdiyimi yaxşı bilirdim. Amma özgə əlacım yox idi. Bu dağların hər qarışına mənim kimi bələd olan yox idi.

Təxminən yarım saatdan sonra düşmən səngərindəki qarmaqarışıqlıq, çaşqınlıq döyüşçülərimizə həlledici hücum fürsəti yaratdı. Heç bir itkisiz Drambona daxil olan rotanın döyüşçüləri bayaqdan onlara baş qaldırmağa imkan verməyən səngərdə yalnız sükutla rastlaşdılar…

Məharətlə düşmən səngərinin arxasına keçən Vəzirin bu manevri o qədər gözlənilməz olmuşdu ki, dalbadal iki qumbara partlayışından sonra yaraqlılar silahlarını hansı tərəfə tuşlayacağını müəyyənləşdirənədək Vəzir otuzdan çox qulduru gəbərtmişdi. Təkbaşına! Bütöv bir rotaya qarşı!».

Mənə elə gəlir ki, Azərbaycanlı oğulların nəyə qadir olduqlarını demək üçün başqa açıqlama vermək yersizdir. Cəmi dörd qumbara və bir avtomatla təkbaşına, təpədən-dırnağa silahlanmış qəddar, vəhşi erməni quldurlarının arxasına keçib, bütöv bir rotaya qarşı vuruşmaq insandan çox böyük cəsarət, hünər və bacarıq tələb edirdi. Bu saydığım qabiliyyətlərin hamısı Vəzirdə cəmləşmişdi və o Azərbaycanın Milli Qəhrəmanı adına tam layiq idi.

Lakin demək olmaz ki, Vəzir tək idi. Onun kimi fədakar, ürəyində vətən məhəbbəti daşıyan oğullar həddindən çox idi həmin illərdə.

«Tərtər» batalyonunun yaradıcılarından biri və ilk komandiri, Ağdərə bölgəsinin Çaylı, Qırmızıkənd, Drambon, Çıldıran, Sırxavənd, Marquşevan, Seysulan, Yarımca və digər yaşayış məntəqələrinin düşmənlərdən təmizlənməsində öz batalyonu ilə birgə fədakarlıqlar göstərən, düşmənin xeyli canlı qüvvəsinin və texnikasının məhv edilməsində xüsusi rolu olan, Vəng uğrunda gedən ağır döyüşlərdə şəhidlik zirvəsinə ucalan Azərbaycanın Milli Qəhrəmanı Elman Süleyman oğlu Hüseynov, ağlasığmaz cəsarəti, ölümün gözünə dik baxması, mərdliyi, hünəriylə bütöv bir ordunu arxasınca aparmağa qadir, əfsanəvi qəhrəmanlardan biri olan Mehrac Məhəmməd oğlu Mahmudov, «Topçu Ədalət» kimi adını döyüş tariximizə yazan, Tərtərin müdafiəsində xüsusi fədakarlıq göstərən, dəfələrlə ağır yaralanmasına baxmayaraq, döyüşlərdən çəkilməyən, Ağdərənin Drambon kəndi uğrunda gedən döyüşlərdə şəhid olan Ədalət Paşayev, düşmənə əsir düşməmək üçün ölümü üstün tutan Yunus Nəcəfov, «Qozlu körpü» ətrafındakı döyüşlər zamanı cəmi 10 nəfərlik dəstəsi ilə birgə düşmənə ciddi müqavimət göstərən, bir neçə ağlasığmaz hücumdan sonra şəxsi igidliyi sayəsində öz dəstəsini mühasirədən çıxaran, fədakar, igid əsgər Hicran Abbasov, döyüş əməliyyatları zamanı Azərbaycanın üçrəngli bayrağını Ağdərəyə sancan cəsur döyüşçü İlham Cəfərov, düşmən tankını susdurmaq üçün fikirləşmədən həyatını qurban verən 21 yaşlı Ziyadxan İslam oğlu Aslanov, «PK» pulemyotu özündən hündür olan, Vəzir



Orucovun yaxın silahdaşı, igidliyinə, hünərinə görə «Qoçu» ləqəbi qazanmış Ətraf İsa oğlu Əliyev, düşmənə göz açmağa imkan verməyən İlham Mustafayev və adlarını çəkmədiyim yüzlərlə vətən oğulları… Şəhid olanları da var, hal-hazırda yaşayanları da. Onların hər biri ayrı-ayrılıqda qəhrəmandır, canlı tarixdir. Bizlərə isə ömrümüzə yazılan bu tarixi unutmamaq, unutdurmamaq qalır.

Müqəddəs kitablarımızda yazılır: «Alimin qələmindən düşən hər damla mürəkkəb, bir şəhid qanına bərabərdir».

Elə bu baxımdan ziyalılarımızın, yazarlarımızın üzərinə böyük vəzifələr düşür.

Bu gün düşmən tapdağında qalan torpaqlarımız, şəhid olan igidlərimizin nigaran ruhları, qaçqın düşərgələrində doğulub-böyüyən, bəlkə də haralı olduğunu bilməyən körpələrimiz, yurduna həsrət, ölümləriylə üz-üzə qalan ağsaqqal babalarımız, ağbirçək nənələrimiz, daha nələr, daha hansı mövzular bu gün yazılmasını gözləyirlər.

İstedadlı və vətənpərvər yazarımız olan Tofiq Yusifin bu kitabı haqqındakı ön sözümü, kitabın axırında özünə yer tutan «Vəhşilər» poemasından bir parça ilə bitirmək istəyirəm. Bu sətirlər bir azərbaycanlı və qarabağlı kimi, ürəyimdə qövr eləyib inləyən arzularımı aşkarlayır.

Torpaqlarımızın erməni yağılarından təmizlənəcəyi, yaraları sızıldayan şəhidlərimizin ruhlarının dinclik tapacağı, yanan ürəklərimizə su səpiləcəyi günü gözləyirik! Bir yağış, həsrətilə gözləri üfüqə dikilib qalmış, qızmar günəşin yandırıb yaxdığı, cadar-cadar olmuş susuz səhranın leysan gözlədiyi kimi gözləyirik!

Parçalanmış ürəyinə
qurban olum, ***AZƏRBAYCAN –***
***ANA VƏTƏN!***
Bir silkələn!
Qazan xanın qılıncını
dayaq elə!
Nəsiminin köynəyini

bayraq elə!
Mehdilərin, Həzilərin,
Gərayların, Vəzirlərin
qeyrətini çıraq elə!
Hər daşını, hər kolunu
yaraq elə!
Hər oğlunu, hər qızını
silaha sıx, patron elə,
daraq elə!
Məlik kimi qıpçaqların,
öz evindən qaçaqların,
boğosların, vartanların –
bu torpağın üzərində
ilan kimi yatanların
qəddini əy – oraq elə!
Boş-boşuna
«mənəm, mənəm!» – deyənlərin,
qeyrətini yeyənlərin
varlığını boz kül elə,
torpaq elə!
Bükülərək yerə gəlmiş
dizlərini düzəlt, dikəl!
Ey ***ULU YURD***, ey ***QOCA NƏR,***
özünə gəl!
Havalansın qoy sinəndən
igidlərin ***«VƏTƏN!»*** – deyən
od nərəsi!
Bu nərədən lərzə gəlsin,
səni hələ yazıq bilən,
səni hələ tanımayan
***YER KÜRƏSİ!!!***

***Solmaz Kazımova***



# Şəhidlik xoşbəxtliyi



# Əfsanəvi qəhrəman

Vəzir Surxay oğlu Orucov…

Əfsanəvi qəhrəman, namərd düşmənin üstünə əlində silah gözünü qırpmadan gedən qorxubilməz, yenilməz bir igid. «Azərbaycanın Milli Qəhrəmanı» adına layiq görülmüş Tərtərin ilk cəngavər oğlu. Döyüşçü dostlarının xatirələrində, Azərbaycan xalqının ürəyində özünə əbədi məskən salmış əsl vətəndaş. Bu gün onun cəsarəti, döyüşlərdə göstərdiyi igidlikləri haqqında saysız-hesabsız rəvayətə bənzəyən, əslində isə gerçək olan neçə-neçə maraqlı əhvalatlar danışırlar. Onun hər döyüşü bir qəhrəmanlıq salnaməsidir.

Vəzir Orucov 1956-cı il dekabr ayının 11-də Tərtər rayonunun Xoruzlu kəndində anadan olmuşdur. Orta təhsilini doğma kəndində başa vurduqdan sonra 1974-cü ildə Bakı Yüngül Sənaye Texnikumuna daxil olmuşdur. Bir il sonra hərbi xidmətə çağrılmış, hərbi xidmətdən sonra təhsilini başa vurub doğma rayonuna dönərək əmək fəaliyyətinə başlamışdır. 1982-ci ildən



1992-ci ilədək ailə həyatı quraraq Rusiyanın Arxangels Vilayətində yaşamışdır.

Dağlıq Qarabağ hadisələri tuğyan etdiyi bir vaxtda Vəzir dözməyib doğma torpağına qayıdaraq «Tərtər» özünümüdafiə batalyonuna daxil olmuşdur. Sıravi döyüşçü kimi mübarizəyə başlayan Vəzir Orucov batalyon komandirinin müavini vəzifəsinədək yüksəlmişdir. O, 1992-ci il sentyabr ayının 1-də Ağdərə bölgəsində Çıldıran kəndi uğrunda gedən döyüşdə ağır yaralanmışdır. Noyabr ayının 2-də tam sağalmasa da yenidən ön cəbhəyə döyüşə getmişdir. Ağdərə bölgəsinin azad olunmasında misilsiz qəhrəmanlıqlar göstərmiş, cəsurluq və qorxmazlıq rəmzi kimi əbədilik yaddaşlara hopmuşdur.

Vəzirin adı gələndə ermənilər tir-tir əsirdilər. Onun başına qiymət də qoyulmuşdu. Kim Vəziri öldürsə ona mükafat veriləcəkdi.

Vəzir Orucov həm kəşfiyyata, həm də döyüş əməliyyatlarına gedirdi. Onun «PK»sının və qumbaraatanının sorağı hər yana yayılmışdı. Şəhid olduğu ana qədər Vəzir yüzlərlə erməni quldurunu məhv etmiş, düşmənin onlarla hərbi maşınını və texnikasını sıradan çıxarmışdı. Qorxu deyilən hiss Vəzirdən çox-çox uzaq idi. O həmişə döyüş əməliyyatlarının önündə gedərək öz cəsurluğu və qorxmazlığı ilə bütün döyüşçülərə nümunə olmuşdu.

**Döyüş yoldaşlarının dediklərindən:**

***Zahid İmanov:***

– Vəzir Orucov cəngavər bir oğlan idi. O, həmişə deyirdi:

– Hücuma keçməzdən əvvəl mütləq kəşfiyyata gedib öyrənmək lazımdır ki, görək irəlidə nə var, nə yox? Sonra hücuma keçmək olar.

Kəşfiyyata getməmişdən əvvəl həmişə kimin getmək istədiyini öyrənirdi.

Bir dəfə məndən soruşdu:

– Zahid, biz döyüşə gedirik. Birdən üzə düşərsən, istəyirsən uşaqlarnan qal.

Dedim:

– Yox mən könüllü gedirəm. Sənlə hara olsa gedərəm, lap ölümə də.

O da dedi:

– Yaxşı, elədirsə getdik .

Drambonda vəziyyəti öyrənmək üçün kəşfiyyat qrupumuz yola düşdü. Həmişə Türk İsmayılla özü gedirdi irəli. Deyirdi ki, siz gözləyin, icazə verəndə gələrsiniz. O, həmişə belə idi. Ən çətin şəraitdə, ən çətin yerlərə birinci özü gedərdi.

O, vaxt ermənilər Vəzirin başına 30-40 min pul ayırmışdılar.

***Əyyub Əhmədov :***

– Madagiz uğrunda gedən döyüşlərdə uşaqlar qarşı tərəfdən ermənilərin başını qatdılar, biz arxa tərəfə keçdik. Gördük ki bir «UAZ» gəlir.

– Yoldan çəkilməyin,- dedi Vəzir.

O, bunu ona görə dedi ki, ermənilər bizdən şübhələnməsin, elə bilsinlər ki, öz adamlarıdır. «UAZ» dayanan kimi Vəzir erməni komandirini gözündən atdı.

Döyüşlərin birində ermənilər bizə hücum etdi, çəkildik geriyə. Vəzir vaxtında gəlib çıxmasaydı, ermənilər bizi mühasirəyə salıb ya qıracaq, ya da əsir götürəcəkdilər.

Bir az sonra ermənilərin texnikası üstümüzə hücuma keçdi. Deməyəsən, aşağıda gizləniblərmiş. Patronumuz qurtarmışdı, köməyimizsə yox idi. Vəzir vaxtında gəldi. Bizə çatan kimi qışqırdı:

– Qorxmayın!

Həyəcanımız bir anda yox oldu. Döyüşdük və qalib gəldik.

***Vaqif Abdullayev:***

«Tərtər» batalyonunun özündə çox cəngavər oğlanlar var idi. Vəzir Orucov birinci dəfə batalyona gələndə yeddi nəfərlə gəlmişdi. «Vzvod» komandiri təyin edildi:

O, vaxt batalyonumuzun komandiri rayonumuzun hərbi komissarı Boris Zöhrabov idi. O,rəhmətlik Elman Hüseynov (Milli qəhramanımız), qərərgah rəisi Pənah Məmmədov və mən qərara gəldik ki, Vəzir Orucovu bizim batalyona götürək.

Vəzir Orucov çox çevik hərəkətləri ilə və yaxşı düşünülmüş əməliyyatalarıyla özünü tez bir zamanda tanıtdı. O, çox ürəkli oğlan idi. Rusiyada yaşamışdı. Azərbaycanın başı üzərini qara buludlar alanda oradan birbaşa döyüşə gəlmişdi. Gələn günü də bizim batalyonun üzvü oldu.

«Uqolnik» deyilən yüksəklikdən ermənilər texnikadan istifadə edirdilər. Verdikləri kəndi geri almaq planları var idi. Bu baş tutmadı. Vəzirin və kəşfiyyatçı yoldaşlarının səyi nəticəsində onların planları alt-üst oldu. Ümumiyyətlə Vəzirin kəşfiyyat qrupunun döyüşdən əvvəlki fəaliyyətı həmişə qələbəmizin yarısını təmin etmiş olurdu.

Bir dəfə rəhmətlik Vəzir və onun kəşfiyyat dəstəsi ermənilərin arxasına keçmişdi:

Mən isə digər dəstələrlə başqa tərəfdən irəliləyirdim. Vəzir Orucov kəşfiyyatda çox gözüaçıq, peşəkar döyüşçü idi. Yuxarıdan bizə xəbərdarlıq etdi:

– Üzərinizə «karopka» gəlir, hara gedirsiniz? («karopka» şərti ad idi, yəni «BMP» gəlir).

Təpəyə çıxıb baxdıq ki, «BMP» düz bizim üstümüzə şığıyır. Cemdə bir qumbaraatan vardı. Bu, bir dəfə atmaq üçün idi. Özümüzə mövqe seçdik.

Beləliklə, Vəzir bizi ölümdən qurtardı.

***Suliddin Yusibov:***

– Artıq «Turbazanı» alıb, çıxmışdıq « Rus bulağı»nın yanına. Avqust ayının 22-si növbəti hücumumuz «Ayı heykəli»nin ətrafında olmalı idi. Məlum oldu ki, ermənilər həmin yüksəklikdə bənd alıblar. Kəşfiyyata getdik. Hardasa bir kilometr yolu qaça-qaça getdik. Əvvəlcədən ermənilərə tərəf güllə atmışdıq və görmüşdük ki, bizə cavab atəşi haradan gəlir.

Vəzir bizi qaldırdı həmin yüksəkliyə, «Ayı heykəli»nin yanına. Erməni bizi əsas Sərsəng tərəfdən gözləyirdi. Vəzir dedi ki, biz bu tərəfdən gedirik. Onların əsas gözlədiyi yer gölün qırağıdır.

Bir də eşitdik ki, «Ayı heykəli» tərəfdən maşın gəlir. İsmayıl dedi ki, bu maşın mərmi gətirir. «Kamaz» gəlib keçəndə, Vəzir göstəriş verdi ki, onu vuraq. Biz maşını vurduq, başladı yanmağa , «Kamaz»la birlikdə gələn «UAZ» markalı maşın

geri qayıtdı, Vəzir «PK» ilə yolu kəsdi və «UAZ»-ı da vurdu. Həmin gün gedib dirəndik Drımbon kəndinin gədiyinə. Tərtərin torpağı Vəzir kimi, Elman müəllim kimi oğulların hesabına qorunub saxlandı.

***Nizami Heydərov:***

– 1993-cü ilin mart ayının 22-də Vəzirlə döyüşə gedəsi idik. Paprəvəndin üstündə Ağdərə tərəfdə «Qlobus» deyilən yüksəkliyə hücum etməli idik. Vəzir bizim komandirimiz idi.

Qabaqda piyada qüvvələr vardı. Gördük ki, «Qlobus»a çıxan yoldan bir erməni maşını gəlir.

Dedim:

– Vəzir, gəl hücuma başlayaq.

Dedi:

– Gərək əvvəlcə yolu kəsək ki, onlara kömək gəlməsin.

Həmin «Kamaz» maşın xeyli canlı qüvvə gətirirdi. Maşının geri qaçmağı mümkün deyildi. Vəzir «Kamazı»ı vurdu. Bir az keçdi, bir «Qaz-66» markalı maşın da gəldi. Onu da vurduq, yol kəsildi. İndi döyüşə gedə bilərdik.

Götürdüyümüz uşaqları böldük, yarısı mənlə sağ tərəfdən hücuma keçdi, yarısı Vəzirlə sol tərəfdən. Hardasa iki saat idi ki, döyüşə girmişdik, qırğın gedirdi. Vəzir tərəfdə nəsə sakitçilik hiss elədim.

O vaxt icra hakimiyyətinin başçısı işləyən Sərdar Həmidov rabitə ilə dedi:

– Nizami, Vəzir haqqında mənə tez bir məlumat ver, gör nə olub orda?

Himayətlə Rafiqi göndərdim ki, Vəzirgildən xəbər gətirsinlər.

Rafiq gəldi ki, artıq Vəzir yoxdur. Mən də məcbur olub döyüşü yarımçıq qoydum qayıtdım geri.

Vəzirin ölümündən sonra hamı avtomatı tulladı ki, Vəzir yoxdursa, biz gedirik, qələbə olmayacaq. Uşaqlarda belə inam vardı.

Mən döyüşçüləri sıraya düzüb dedim:

– Götürün avtomatınızı, mən bir-iki kəlmə söz deyim, sonra yenə öz bildiyinizi edərsiniz.

Onlar avtomatlarını götürüb düzüldülər sıraya, dedim:



– Biz Vəziri itirmişik, indi gəlin fikirləşək, Vəzirin qanını almalıyıq, yoxsa qayıdıb getməliyik?

Dedilər:

– Qanını almalıyıq.

Dedim:

– Onda silahları götürmək lazımdır. Vəzirin ölümü bizi ruhdan salmamalıdır, əksinə daha da qəzəblənməliyik və torpaqlarımızı düşmənlərdən geri almalıyıq.

İnanın ki, biz on gün gecə-gündüz hücum etdik. O, döyüşdə bir neçə igid oğlanlarımız yaralandı, şəhid oldu, amma məqsədimizə çatdıq və həmin yüksəkliyi aldıq. Həmçinin Vəzirin qanını da əvəzsiz qoymadıq. Həmin döyüşdə ermənininin 100-ə yaxın canlı qüvvəsini və onlarla texnikasını məhv etdik.

***Pənah Məmmədov:***

Müharibənin ən çətin günü mənim üçün Vəzirin ölüm günü olub–1993-cü ilin mart ayının 22-si. Bu mənim ən ağrılı günümdür. Mən onun ölümünü eşidəndə, rabitə xəttində ağladım.

Fəqan mənə rabitədə dedi ki, artıq Vəzir yoxdur. Bütün müharibə dövrü ərzində eşitdiyim ən ağır söz idi bu söz. Bəlkə heç indi də özümə gələ bilməmişəm. Çünki Vəzir, Vəzir idi. Onun döyüş epizodları çox olub. Müharibəni Ağdərə istiqamətində Vəzir aparırdı. «Tərtər» batalyonunda Elman müəllimlə bir başa xidməti olan adam idi Vəzir.

Müharibə dövründə çox şəhidlərimiz olub. Elman müəllim, Talıstan, Tahir, Rafiq və s. Vəzirin ölümü isə bütün Azərbaycan ordusuna təsir etdi, eləcə də mənə.

Ermənilərin bir Əfqanıstan qəhrəmanı var idi, «Qoralisa» deyirdilər. Ermənistan müdafiə nazirinin qardaşı idi. Onu bizimkilər vurmuşdular. Vəzir vurulanda, onlar toy-bayram etmişdilər ki, qəhrəmanın intiqamını aldıq, yəni onlar öz milli qəhrəmanlarına uyğun bir adam öldürdüklərinə görə sevinirdilər.

***Başqa bir xatirəsində:***

Elman müəllim rəhmətə getdi. O vaxt mənim qolum işləmirdi, qıçım işləmirdi, yaralanmışdım. Amma Nəcməddin Sadıqo-

vun göstərişi ilə gecəynən məni yataqdan qaldırıb gətirdilər. Bu olubdu 1992-ci il iyun ayının 8-də.

O vaxt Ağdərəni 2-ci dəfə erməni almışdı, bizim batalyonu da ləğv eləmişdilər.

Batalyonu yenidən yığmaq lazım idi. İyul ayının 28-də təzədən göstəriş verdilər ki, batalyon yığılsın.

Nəcməddin Sadıqov arxamca maşın göndərmişdi:

– Yaralı vəziyyətdə olsa da, deyin gəlsin.

Gəldim icra hakimiyyətinə. Ora-bura zəng etməklə batalyonu yığdım. Batalyonda 220-yə yaxın uşaq vardı. Mənə komandir olmağı təklif etdilər, amma mən çətinliklə yeriyirdim, qıçım işləmirdi.

Təklif etdim ki, Vəzir Orucov komandir olsun.

Siz Vəzirdəki cəsarətə, qabiliyyətə, ürəyə baxın ki, dedi:

– Yox, Pənah müəllim, sən bizim komandirimizsən, mənə göstəriş ver, haranı lazımdır, alacağam. Sənə də dörd nəfər ayıracağam ki, xərəklə də olsa hara lazımdır, çiyinlərində səni ora aparacaqlar. Sən ancaq mənə göstəriş ver.

Bilirsiniz, döyüşə rəhbərlik etmək, idarəetməni bilmək asan iş deyil. Vəzirin gözəl komandirlik bacarığı vardı. Lakin o mənim təcrübəli hərbçi olduğumu bildiyindən belə deyirdi. Bütün igidliklərinə rəğmən həm də çox təvazökar insan idi Vəzir.

Vəzir Orucovun həyat yoluna nəzər salarkən «qəhrəmanları şərait yetişdirir» deyənlərə haqq verirəm. Sadə bir ailədə doğulub, adi bir insanın həyatını yaşayan Vəzir bir arzusunu tez-tez dilinə gətirərdi: «Kaş ölüm azacıq möhlət verəydi, Xankəndində bayrağımızı dalğalandıraydım…» Lakin vətənin dar günündə əsl vətənpərvər oğul kimi öz qəlbinin diktəsi ilə torpaq uğrunda, xalq uğrunda döyüşlərə qatılan və savaş meydanını əsl qəhrəman kimi tərk edərək, ömrünü vətən torpağına qurban verən Vəzirin arzusu kimi ömrü də yarımçıq qaldı...

1993-cü il mart ayının 22-də Ağdərə bölgəsində «Qlobus» yüksəkliyi uğrunda gedən döyüşlərdə qəhrəmancasına şəhid oldu. Ona ölümündən beş gün sonra – mart ayının 27-də «Azərbaycanın Milli Qəhrəmanı» adı verildi. Vəzir Orucovun məzarı Bakıda



«Şəhidlər Xiyabanı»ndadır. Onun adı doğulduğu Tərtər rayonunda da əbədiləşdirilmişdir. Şəhərimizin veteranlar bağında onun büstü qoyulmuşdur. Xatirəsi isə döyüş dostlarının, onu tanıyanların və bütün Azərbaycan xalqının qəlbində yaşayır. Onun həyatı bu günkü əsgərlərimiz üçün bir örnəkdir. Çünki, Vəzir Orucov hamımızın fəxr etdiyi əfsanəvi bir qəhrəmandır.

Özündən sonra Camal adlı bir oğlu və yaddaşlardan silinməyən xatirələri yaşayır.



# Əbədiyaşarlıq

Elman Süleyman oğlu Hüseynov 1952-ci il fevral ayının 28-də dünyaya göz açmışdır. Atasını erkən itirmişdi. Anası Hüzrə xanım 7 balasını—beş qızını və iki oğlunu təkbaşına böyütmüşdü. Böyük oğlu Salman bacı-qardaşlarına həm də atalıq etmişdi.

Elmanın orta məktəbdə yaxşı oxuması, bütün fənlərə son dərəcə maraq göstərməsi müəllimlərinin də diqqətini cəlb edirdi. O, böyüdükcə maraq dairəsi də genişlənirdi.

Elman Hüseynov ali təhsilli mühəndis idi. İnstitutu bitirəndən sonra o, Zaqafqaziya Hərbi dairəsində (Axalkalakidə) hərbi təlim keçmişdi, hərbi elmlərə yiyələnmişdi.

1991-ci ilin sentyabr ayına qədər rayonumuzda müxtəlif məsul vəzifələrdə çalışıb.

1991-ci il sentyabr ayının 22-də rayonda ərazi özünümüdafiə qərargahı təşkil edib, onun rəisi olub. Həmin ilin noyabr ayından isə «Tərtər» batalyonuna ilk komandir təyin olunub. Komandir olmağın məsuliyyətini gözəl dərk edən Elman Hüseynov «Tərtər» batalyonunun siyasi oyunlara cəlb edilməsinə yol verməyib.

Elman Hüseynov torpağımızın hər qarışı üçün canından keç-



məyə hazır oğul idi.

Elman, Vəzir, Mehrac, Ədalət kimi oğulların hesabına Tərtər batalyonuna «Yenilməz batalyon» adı verilmişdi.

Lüləsaz, Şişqaya, «Qanlı təpə» əməliyyatlarında Elman Hüseynovun başçılıq etdiyi hərbi hissə xüsusi qəhrəmanlıq nümunəsi göstərmişdi.

Son döyüşü 1993-cü ilin yanvar ayında olmuşdu. Vəng uğrunda gedən döyüşlərdə Elman Hüseynov snayper gülləsindən qəhrəmancasına həlak oldu.

Tərtərin iki Milli qəhrəmanlarından biri kimi onun adı əbədiləşdirildi. Döyüş dostları, tərtərlilər onun xatirəsini həmişə böyük ehtiramla yad edirlər. Şəhərimizin mərkəzi küçələrindən biri Elman Hüseynovun adını daşıyır və həmin küçədə qəhrəmanın büstü ucalır.

Bu gün onun övladları ataları ilə fəxr edir.

Elman Hüseynov döyüş yoldaşlarının xatirəsində necə qalıb?

**Pənah Məmmədov:** «Mən tərtərliyəm. «Tərtər» özünümüdafiə batalyonunun yaranmasında iştirak etmişəm. Boris Zöhrabov hərbi komissar olan dövrdə Milli Qəhrəmanımız Elman Hüseynov batalyonu yaradarkən 1991-ci il dekabrın 13-də qərargah rəisi təyin olunmuşam. Rəhbərlik etdiyimiz «Tərtər» batalyonunun Ağdərənin alınmasında xüsusi xidmətləri olub. Bu qələbə Elman Hüseynovun, Vəzir Orucovun və başqa igidlərin hesabına əldə edilib».

**Nizami Heydərov:** «Elman yaxşı dost, yaxşı yoldaş idi. Çox vaxt onunla birgə gedirdik döyüşə. Allah ona rəhmət eləsin, Vəzir də, o da müharibə adamları idilər».

Bəli, insan var ki, gəlir, yaşayır və dünyanı tərk edir. Özündən sonra bir iz buraxmır. İnsan da var, Elman kimi, Vəzir kimi, Mehrac kimi, Ədalət kimi mənalı ömür yaşayır və onları tanıyanların xatirələrindən silinmir, əbədiyyət qazanır.



# Mənalı ölüm

Mehrac Məhəmməd oğlu Mahmudov 1958-ci il yanvarın 17-də Tərtər rayonunun Səhlabad kəndində anadan olub. 1975-ci ildə həmin kəndin orta məktəbini bitirib. 1977-1979-cu illərdə Sovet Ordusu sıralarında Xaborovski şəhərində hərbi xidmətdə olub. Texnologiya institutunu bitirib. 1980-ci ildə sərbəst güləş üzrə «Usta» normasını yerinə yetirib.

1992-ci ilin əvvəllərindən 1994-cü ilin aprel ayının 23-nə qədər Qarabağ Müharibəsində iştirak edib.

Üç övladı var – Ziya, Xəyalə, Aygün.

**Bu torpağı qibləgah san,**
**Öz elində ocaq ol, yan.**
**Vətənə qurban olmayan**
**Can nəyimə gərək mənim?**

Nə qədər ki, həyat var, ölümlə qolboyundur. İnsan doğulduğu andan başlayaraq ölümə doğru yol gedir. Yəni ölüm labüddür, qaçılmazdır. Elə bu baxımdan insan gərək həyatını mənalı yaşasın. Mənalı yaşamaq ömrü də, ölümü də dəyərli edir. Mənasız yaşamaq isə ölümdən də betərdir.



Hər kəsə mənalı ömür və mənalı ölüm qismət olsun! Amin!

… Qarşımda xeyli sənəd, qəzet və şeirlər var. Onları vərəqləməmişdən əvvəl Mehrac Mahmudovun döyüş yoldaşlarının onun haqqında danışdıqlarını yadıma saldım. O vaxt «Tərtər» Batalyonunun qərargah rəisi olmuş Pənah Məmmədovdan, «Azərbaycan Bayrağı» ordenli Nizami Heydərovdan, Qarabağ Müharibəsi Əlilləri, Veteranları və Şəhid Ailələri İctimai Birliyi Tərtər Rayon Şöbəsinin sədri olan Suliddin Yusibovdan və onlarla digər silahdaşından Mehracın necə qorxmaz, igid və cəngavər bir oğul olduğu, ermənilərə necə qan uddurduğu barədə dəfələrlə eşitmişdim. O, həm də bacarıqlı bir komandir kimi özünü tanıtmışdı.

Savaş vaxtı döyüşçü yalnız öz canını qoruyur, komandir isə həm öz canının qayğısına qalır, həm də döyüşçülərinin taleyinin və vuruşmanın məsuliyyətini daşıyır. Çox çətin işdir!

Mehracın Azərbaycanın Milli Qəhrəmanları, öz həmyerliləri, əvəzedilməz oğullar Vəzir Orucovla və Elman Hüseynovla çiyin-çiyinə gərgin döyüşlərdə iştirak etdiyi və sücaətlər göstərdiyi də mənə məlum idi.

… Qəzetlərə baxıram.

«… Mehrac müharibənin başlandığı ilk günlərdən Tərtərdə təzəcə yaradılmış könüllülər batalyonuna yazıldı. 1992-ci ildə Azərbaycan Ordusunun hücumları dövründə o, Marağaya, Marquşevana, Ağdərəyə ilk daxil olan döyüşçülərdən biriydi. Mehrac Vəng kəndinə kimi ağır və şərəfli döyüş yolu keçmişdi. Dəfələrlə yaralanmasına baxmayaraq, heç vaxt döyüş yoldaşlarını səngərdə tək qoymamışdı. Lakin axırıncı dəfə minaya düşməsi onu bir müddət dostlarından ayırmışdı.

2 aprel 1993-cü ildə Mehrac «Tərtər» Özünümüdafiə Batalyonuna «vzvod» komandiri təyin edilmiş və oktyabra qədər həmin batalyonda vuruşmuşdu.

1993-cü ilin oktyabrında könüllülərdən ibarət batalyon yaradılır və o, Ağdam bölgəsinə göndərilir…»

*«Alyans qəzeti»,*
*22 oktyabr, 1994-cü il*

«Müharibə… Qanlı döyüşlər və hər döyüşdə qəhramancasına həlak olan igid oğullar…

Bütün bu hadisələr gözlərimiz qarşısında baş verir. Sabah isə qanı torpağa hopan, öz qorxmazlığı ilə möcüzələr yaradan neçə-neçə igidin adı tarixin daş səhifələrinə köçürüləcək.

Belə cəsur döyüşçülərimizdən biri də Mehrac Məhəmməd oğlu Mahmudovdur.

O müharibə başladığı vaxtdan döyüşə atılıb. Könüllülərdən ibarət dəstələr düzəldib, gecələr isə soyuq səngərlərdə yatıb.

Tez bir zamanda igidliyi hər tərəfə yayılıb.

Xocalı hadisələrindən sonra onun düşmənə olan nifrəti daha da gücləndi. Neçə ermənini girov götürüb öz əsirlərimizlə dəyişdirdi.

…Marquşevan kəndi istiqamətində güclü döyüş gedirdi. Mehrac hamıdan öndə idi. Güllə yağış kimi yağırdı. İrəlidə gedən tankımızı vurmuşdular. Lakin yağan güllələr heyətin içəridən çıxmasına imkan vermirdi, tank isə yanırdı. Mehrac döyüşə-döyüşə tanka yaxınlaşdı və bir gözqırpımında tankın içərisindəki yaralı döyüşçünü xilas etdi. Bunu o qədər cəldliklə yerinə yetirdi ki, sanki düşmən də bu hərəkətdən çaş-baş qaldı.

… Mehrac Mahmudov Ağdərə ərazisindəki Akop Kamari, Çardaqlı, Malakanlar kəndləri uğrunda gedən döyüşlərdə fəal iştirak etmiş, düşmənin bir neçə zirehli texnikasını və canlı qüvvəsini şəxsən məhv etmişdi…»

***«Yeni dünya» qəzeti,***
***8 oktyabr 1994-cü il.***

«1993-cü il dekabrın 27-də xəbər gəlir ki, azğın düşmən Papravənd, Boyəhmədli, Qarapirim istiqamətindən 17 tank və 500-ə yaxın canlı qüvvə ilə Güllücəyə genişmiqyaslı hücuma keçib.

Əməliyyat planını hazırlamaq Mehraca həvalə olunur.

Bu döyüş çox uğurla başa çatır, qarı düşmən 7 tank, 350-yə yaxın canlı qüvvə itirərək geri çəkilməyə məcbur olur».

***«Zaman» qəzeti,***
***15 oktyabr 1994-cü il.***

«Mehrac Məhəmməd oğlu Mahmudov ali təhsilini Moskvada alıb. 1988-ci ildə Vətənə qayıdaraq torpaqlarımızın müdafiəsində iştirak edib. Əvvəlcə Tərtər bölgəsində döyüşüb, 1993-cü ilin sonunda isə Ağdama göndərilib.

Sıravi döyüşçüdən batalyon komandirliyinə kimi yüksəlib.

Bütün döyüşlərdə öndə gedən komandir əsgərlərə ən böyük mənəvi dayaq idi. Hər günü bir qəhrəmanlıq dastanı olan Mehracın özünü reklam etdirməkdən zəhləsi gedirdi…»

***«Müxalifət» qəzeti,***
***28 iyun 1994-cü il.***

«Mehrac zabit olsa da özünü sıravi əsgər kimi aparırdı. Ən ağır işlərə özü gedirdi.

… Dekabrın 31-də ermənilərin növbəti hücumu zamanı Mehrac əlində pulemyot («PK») ayaq üstə dayanmışdı, yerə də yatmırdı; qoy onun əsgərləri görsünlər ki, batalyon komandirinin müavini hamıdan qabaqda durub, özü də səngərdən çıxıb. Onda üç batalyondan cəmisi 45 əsgər qalmışdı.

Erməninin 7 texnikası məhv oldu, nə qədər canlı qüvvəsi getdi.

… Bir dəfə də döyüşqabağı elə-belə söhbət eləyirdi. Dedi ki, ağlıma bir şey gəlib, mən güllədən ölməyəcəyəm. Allaha and olsun, məni öldürsə, qəlpə öldürəcək. Yaman böyrümə-başıma qəlpə düşür son vaxtlar».

***«Varlığımız» qəzeti,***
***İyun 1994-cü il.***

Mehrac Ağdam bölgəsində batalyon komandirinin müavini kimi döyüşə başlayanda bədənində 18 qəlpə var idi. O, bu vəziyyətdə Ağdamın Papravənd, Sofulu, Boyəhmədli kəndləri uğrunda aparılan döyüşlərdə fəal iştirak edirdi.

Ölümündən bir neçə gün əvvəl iki nəfər döyüşçü yoldaşı ilə kəşfiyyata gedən Mehrac üzüm bağının içində qəfildən ermənilərlə rastlaşır. Onun əlində «PK» pulemyotu, çiynində isə qumbaraatan varmış. Ermənilər çox olsalar da, Mehrac qumbaraatanla onlardan 8-ni öldürür, 5-ni isə yaralayır. Yaralı erməniləri batalyona gətirir.

Güllücə istiqamətində gedən sonrakı döyüşlərdə də Mehra-

cın komandanlıq etdiyi qüvvələr düşmənə dalbadal ağır zərbələr vurur. Ermənilər bir döyüşdə 1 tank, 1 «PDM» və onlarla canlı qüvvə itirir. İkinci dəfə isə Kamo adlı polkovnik və bir erməni mayoru «UAZ» markalı maşında əsir götürülür. «UAZ»-da olan Yaponiya istehsalı radioqəbuledici və 1 ədəd «AK-74» markalı avtomat da qənimət kimi ələ keçirilir. Mehrac özü bu əməliyyatda 8 erməni öldürür.

1994-cü il aprelin 23-də batalyon komandiri Salam Sadıxovu yeni vəzifəyə, Mehracı isə onun yerinə təyin edirlər. Həmin günü Mehrac evlərinə gedir. O, evdə hamıyla görüşür. Qayıdarkən bacısına deyir:

– Bajı, birdən mən ölüb-eləyəsi olsam, qəbrimin üstündə avtomat atarsan.

Bacısı nəsə demək istəyəndə Mehrac ötkəm səslə onun sözünü kəsir:

– Əgər, qəbrimin üstə avtomat atmasan, mənim bajım döyülsən!

… Hissəyə qayıdır. Saat 17-də İlxıçılar kəndi uğrunda qanlı döyüş başlayır. Mehracın batalyonunda cəmi 100-120 döyüşçü qalmışdı. Onlar hücuma keçirlər. Ermənilərin əlverişli mövqe tutması bizimkilərin vəziyyətini ağırlaşdırırdı. Mehrac heç bir dəlil-dəlalətə fikir vermədən yenə ayaq üstə öndə gedir, əsgərlərini döyüşə ruhlandırırdı.

Ermənilərin «BMP»-si deyəsən komandirin istiqamətini müəyyən etmişdi, həmin əraziyə elə hey mərmi yağdırırdı. Mehrac isə heç nədən çəkinmədən irəliləyirdi. Birdən … lap yanında bir mərmi partladı. «AQS»-nin iki qəlpəsi sağ qolunun altından zirehli geyimi deşib bədəninə girdi. Yavaş-yavaş yerə çökdü və yıxıldı. Heç bir söz demədən gözləri üfüqə dikili qaldı…

Adətən insan ölən kimi bədəni soyuyur, qan laxtalanır. Mehracın qanı laxtalanmadı, axırıncı damlasınacan axdı. Bu da Allahın işidi. Axı, Mehrac deyirdi, «Son damla qanıma qədər vuruşacağam!» Allah-təala da onun əhdini yerdə qoymadı. Mehracın bir əhdi də yerinə yetirildi – ömründə əlinə silah almayan bacısı ağlaya-ağlaya onun qəbrinin üstündə güllə atdı.



… Yurdunu, torpağını necə sevdiyi haqqında deyə bilmədiyi sözləri öz ölümü ilə, Vətən qarşısında verdiyi borcla dedi Mehrac.

Şərəfli bir döyüş yolu keçən Mehrac Mahmudov bütün varlığı ilə öz elinə, obasına və vətən torpağına bağlı oğul idi. O, qəhramanlığın zirvəsinə ucala bildi. Vətəni müdafiə etməyi özünə övladlıq borcu saydı. «Kişinin qanı torpağa axar» – dedi. Şəhid olmağı ən dəyərli ölüm bildi. Bunların əvəzində isə heç nə ummadı. Döyüşdüyü hərbi hissə onun Milli Qəhrəman adına layiq görülməsi haqqında Müdafiə Nazirliyinə təqdimat göndərdi. Mehrac Mahmudovun bundan heç xəbəri də olmadı.

Yenə müharibə dövrünün mətbuat səhifələrini vərəqləyirəm. «Bakı», «Ana Vətən», «Ədalət», «7 gün», «Azadlıq», «İslamın sə-si», «Səda», «Tərtər»… qəzetlərində Mehrac Məhəmməd oğlu Mahmudovla bağlı yazıları nəzərdən keçirirəm. Bu insan oğlunun igidliyinə heyrətlənirəm, ölümdən qorxmazlığına təəccüb edirəm. Və istər-istəməz bir sual dondurur məni: «Mehrac kimi oğulları olan Qarabağ niyə basıldı görəsən?!».



# Tərtərlilərin fəxri

Tərtərdə bir ailə var – Paşayevlər ailəsi. Bu ailədən üç mərd, fədakar, cəsur ərən şəhid olub. Bütün tərtərlilərin bu gün də böyük hörmət və ehtiramla xatırladığı uşaqla uşaq, böyüklə böyük olan şair ürəkli Sabir müəllim – Sabir Paşayev. Dərs dediyi minlərlə şagirdləri ondan təkcə riyaziyyat elmini yox, həm də insanlığı, vətənpərvərliyi, alicənablığı, mərdliyi öyrəniblər.

Səmimiyyəti, mehribanlığı, eyni zamanda, igidliyi, qorxmazlığı ilə yaddaşlarda özünə əbədi məskən salan, düşmənlərə qan udduran, Ədalət Paşayev – «Topçu Ədalət».

1965-ci il fevralın 17-də anadan olan, C. Naxçıvanski adına hərbi məktəbi bitirdikdən sonra Səmərqənd Ali Hərbi Komandirlər məktəbində hərbi təhsilini daha da təkmilləşdirib, 1987-ci ildən 1991-ci ilədək Xabarovskidə hərbçi işləyən, Qarabağ savaşı başlayanda dözməyib Vətənə dönərək ön cəbhədə müharibənin od-alovuna atılan, 31 avqust 1993-cü ildə ölümü şərəflə mərdliklə qəbul edib namərdlərin, xainlərin, qəddarların əlilə ömrünü vətən torpağına qurban verən Evarist Paşayev.



Öz ömürləri və ölümləri ilə bütün Tərtər oğullarına bir örnək olan bu üç şəhiddən indi yalnız birindən söz açacağıq – Ədalətdən.

Ədalət Sabir oğlu Paşayev 20 iyun 1956-cı ildə Tərtər rayonunun Balakəngərli kəndində ziyalı ailəsində anadan olmuşdur.

Ədalət Sabir müəllimin böyük oğlu idi. Belə oğullar az-az gəlir dünyaya. Onun haqqında Tərtərdə hamı belə deyir. Özündən böyük də, kiçik də yanır «Topçu Ədalət»in ölümünə. Tərtər şəhər 2 saylı orta məktəbi əla qiymətlərlə başa vuran Ədalət 1972-1977-ci illərdə Azərbaycan Politexnik İnstitutunda təhsil almış, təyinatla Tərtər Elektromexanika zavoduna göndərilmiş, bir müddət zavodda mühəndis işləmiş, sonralar süd emalı zavodunda baş mexanik vəzifəsində çalışmışdır.

1991-ci ildə «Tərtər» Özünümüdafiə Batalyonu yaradılarkən Ədalət həmin batalyona zabit kimi daxil olmuş, rayonun müdafiəsində xüsusi fəallıq göstərmişdir.

Ədalət deyəndə qulaqlarımıza Tərtər uğrunda gedən döyüşlərdə atılan top mərmilərinin səsi gəlir. Onun adı çəkiləndə ermənilər əsirdilər. Yanlış atdığı top mərmisi olmurdu. Ədalət bir topla gecə-gündüz müxtəlif mövqelərdə, soyuq səngərlərdə mərdi-mərdanə dayanaraq murdar, qaniçən, vəhşi düşmənlərimizi lərzəyə salırdı.

Ağdərə rayonunun Marağa, Marquşevan kəndlərindən başlayaraq böyük bir döyüş yolu keçdi Ədalət.

İlk dəfə 1992-ci ilin yanvarında sağ qolundan ağır yaralandı. Rayonun Buruc kəndində yerləşdirilmiş xəstəxanada müalicə olunmaq məcburiyyətində qaldı. Gecənin bir yarısı ağrıları sakitləşdikdən, bir az özünə gəldikdən sonra ilk dediyi söz bu oldu: «Kaş ermənilər mənim yaralandığımı bilməsinlər, bilsələr bu gecə Tərtəri darmadağın edəcəklər!»

Çünki ermənilər bilirdilər ki, həmin dövrdə Tərtərdə yalnız bir top var və onu məhz «Topçu Ədalət» idarə edir.

Xəstəxanadan yarımçıq çıxdı, sağ qolu ilə bir müddət silah tuta bilmədi. Buna baxmayaraq yenə ön cəbhəyə qayıtdı, ermənilərə yenidən qan uddurmağa başladı.

Xocalı faciəsi baş verən gün Ədalətin hiddəti yerə-göyə sığmırdı. Qəzəbindən həmin gün təkcə günortayadək 300 top mərmisi yağdırdı erməni faşistlərinin üzərinə. Hətta bacısı ona günorta yeməyi apararkən üç saata yaxın Ədalətə yaxın düşə bilmədi. Yalnız geri dönüb sonuncu mərmisini götürərkən bacısını gördü. Axırıncı mərmini atdıqdan sonra dərindən nəfəs alaraq atdığı top mərmilərinin təsirindən yerlə yeksan olan binalar və tülkü kimi qaçan erməni dığaları haqqında bacısına ağız dolusu danışdı.

Sonralar Ədalət «Qrad» qurğusundan istifadə etməyə başladı.

Marağa, Marquşevan, Həsənqaya, Qırmızıkənd, Seysulan, Yarımca, Çaylı, Levonarx, 3№li sovxoz, Kasabet, Sərsəng Su Anbarı uğrunda gedən döyüşlərdə top və «Qrad» qurğularından istifadə edərək torpaqlarımızın erməni quldurlarından qorunmasında əsl qeyrət nümunəsi göstərdi.

1992-ci il avqust ayının 24-də şəhər saat 8-9 radələrində Ədalət növbəti döyüş tapşırığı alır. Ağdərə rayonunun Drombon kəndi uğrunda döyüşə getdiyini yalnız bacısına bildirir. Hardan biləydilər ki, bu Ədalətin son döyüşü olacaq? 1992-ci il avqustun 23-də axşam saat 19-da Drombon kəndi uğrunda gedən döyüşlərdə Ədalət döş qəfəsindən ağır qəlpə yarası alaraq mərkəzi xəstəxanaya gətirilir. İlkin yardım edilərək Bəyimsarov kənd xəstəxanasına köçürülür və ağır cərrahi əməliyyata məruz qalır. Əməliyyatdan çıxdıqdan sonra birinci sualı bu olur: «Görəsən bizimkilər Drombonu azad etdilərmi?».

24 avqust 1992-ci ildə axşam saat 17-də ağır vəziyyətdə Bakı şəhərinə – Respublika Kliniki Xəstəxanasına göndərilir. 25 avqust 1992-ci ildə təkrar cərrahi əməliyyata məruz qalır. Ədalət əməliyyat otağına aparılarkən üzünü qapının ağzında dayanan əmisi oğlanlarına tutub deyir: «Kişiliyiniz olsun, Şuşanı azad edin, mənə Turşsudan sərin su gətirin, ciyərim yanır! And içirəm ki, yataqdan qalxan kimi o dığalara yenə qan udduracağam!».

Son sözləri də, son arzusu da bu olur Ədalətin.

Ədalətin daha bir arzusu yarımçıq qaldı bu dünyada – atasının doğma kəndi olan Umudlunu düşməndən azad edib, baba



ocağında qurban kəsmək və Umudlunun torpağundan gətirib atasının qəbrinə səpmək… Onun arzuları kimi ömrü də yarıda qırıldı.

1992-ci il avqust ayının 22-də həkimlərin səyinə baxmayaraq, ölüm onu caynaqlarından buraxmadı. 36 yaşında Ədalət canını Vətən torpağına qurban verdi. O şəhid oldu, lakin xatirəsi nə döyüş dostlarının, nə də tərtərlilərin yaddaşından silinmədi.

Ədalət Paşayev 1994-cü il sentyabr ayının 16-da (ölümündən sonra) torpaqlarımızın erməni işğalçılarından təmizlənməsində göstərdiyi xüsusi xidmətlərə, şəxsi igidliyə və şücaətə görə «Azərbaycan Bayrağı» ordeni ilə təltif edilib. Xatirəsini əbədiləşdirmək üçün, vaxtilə yaşadığı küçəyə onun adı verilib.

Bütün tərtərlilərin fəxri olan, vətənin mərd, igid oğlu Ədalət Tərtər çayının sahilində – şəhər qəbristanlığında uyuyur.



# Vəzirin igid qardaşı Əlyar

Əlyar Surxay oğlu Orucov 1968-ci ildə Tərtər rayonunun Xoruzlu kəndində anadan olmuşdur. Həmin kənddə orta məktəbi bitirmişdir.

İndi də igidliyi haqqında əfsanəyə bənzər həqiqətlər gəzir. Sözün həqiqi mənasında erməni quldurlarına qan udduran bu igid Azərbaycanın Milli Qəhrəmanı Vəzir Orucovun kiçik qardaşı idi.

Qarabağ Müharibəsi başlanandan sona çatanadək ağır döyüşlərdə iştirak edən Əlyar Orucovun özü də qardaşı Vəzir kimi əfsanəvi qəhrəmana çevrilib, adı dillər əzbəri olub.

Vəzirin ölümü onu həddindən çox sarsıtsa da, qardaşının Vətən yolunda şəhid olması ona daxili bir qürur hissi gətirir, onunla fəxr edirdi. Qardaş nisgili, Vəzir kimi bir oğulun itkisi onu köz-köz yandırsa da, həmişə başını dik tutur, məğrur gəzir və ağır dərdini öz iç dünyasında çəkirdi.

Onun erməni separatizminə, erməni vandalizminə, erməni təcavüzünə qarşı qəzəbi, kini günü-gündən artırdı. Ona görə də ən ağır döyüşlərə yollanır, düşmənlərə aman vermirdi. Dəfələrlə yaralansa da, bədəni güllə və qəlpələrlə dolu olsa da, yenə də heç nəyə, hətta sağlamlığına da əhəmiyyət vermədən döyüşlərdə iştirak edirdi. Lakin insan dözümünün də bir sonu olur. İnsan özü dözmək istəsə də, orqanizmi dözmür.

Əlyar Orucov növbəti dəfə ağır yaralanandan sonra canı daha sözünə baxmadı, vəziyyəti ciddiləşdi. Buna görə də Azərbaycan dövləti tərəfindən İran İslam Respublikasına müalicəyə göndərildi..

Əlyar Orucovun keçdiyi döyüş yolları haqqında bir dastan bağlamaq olar və əlbəttə, bu dastan bağlanacaqdır, bir az geci-tezi var. Biz isə Əlyarın qısa, lakin mənalı və şərəfli ömür yolu haqqında yalnız bu kiçik yazı ilə kifayətləndik.

Belə bir məğrur insan nə qardaş dərdinə, nə Vətən nisgilinə dözüb yaşaya bilməzdi. Yaşaya bilmədi də. Çox cavan, həyatının gənc, qaynar çağında, bu fani dünyadan köçdü. Onda 2006-cı il idi…

Heyif Əlyardan!

# Sızlayan yaralar





## «Tərtər» batalyonunun yaradıcılarından biri

Pənah Ağamalı oğlu Məmmədov 1961-ci il mart ayının 13-də Tərtər rayonunun Balakəngərli kəndində kolxozçu ailəsində anadan olmuşdur. Cəmilli kənd orta məktəbini bitirərək 1977-ci ildə Azərbaycan Politexnik İnstitutunun Radiotexnika fakultəsinə daxil olmuşdur. Oxuduğu institutda hərbi kafedra olduğu üçün leytenant rütbəsi almışdır. Mülki ixtisası mühəndis-texnoloqdur, hərbi ixtisası isə taktiki və strateji raketlər üzrədir.

Pənah Məmmədov 1982-1984-cü illərdə Belarusiyada hərbi xidmətdə olmuş, raketatan qurğulara rəhbərlik etmişdir. Həmin vaxt bir çox ölkələrdə hərbi təlimlərdə iştirak etmişdir. 1984-cü ildə baş leytenant rütbəsi almışdır.

1984-cü ilin avqust ayında Qazaxıstanın Kapiyar poliqonunda 2 ədəd raket sınağını əla qiymətlə yerinə yetirərək «Fəxri Fərman» almışdır.

1984-cü ildə ordudan tərxis olunan Pənah Məmmədov ye-

nidən doğma rayonu Tərtərə dönmüş, baş leytenant kimi rayon hərbi komissarlığında qeydiyyata götürülmüşdür.

Əmək fəaliyyətinə rayon elektromexanika zavodunda əvvəlcə texnoloq, sonra usta, baş usta, sex rəisi, rəqəmli aparatlar şöbəsinin rəisi, zavod direktorunun plan-istehsalat üzrə müavini işləmişdir.

1991-ci ildə Qarabağ savaşı başlananda zavoddan ərizəsinə əsasən işdən çıxaraq «Tərtər» Özünümüdafiə Batalyonunun yaradılmasında iştirak etmişdir. 1991-ci ilin sentyabrında isə batalyona rəis təyin edilmişdir.

Ağdərə istiqamətində aparılan uğurlu döyüş əməliyyatlarında 3 dəfə ağır yaralanmış, ancaq yenə də döyüşü tərk etməmişdir.

1992-ci ilin 13 iyununda «Torpaq təpə» əməliyyatlarında çoxsaylı qəlpə yaraları ilə ağır vəziyyətdə Tərtər Rayon Mərkəzi Xəstəxanasına, sonra Bərdə rayon mərkəzi Xəstəxanasına aparılmışdır. Ağdərənin yenidən ermənilər tərəfindən hücuma məruz qaldığı vaxtda xəstəxanadan birbaşa döyüşə getmişdi.

1993-cü il yanvarın 7-də Ağdərədə ağır yaralanaraq 2 saylı Hərbi Səhra Qospitalında müalicə olunmuşdur.

1993-cü ilin mart ayında «Qlobus» və Sərsəng Su Anbarı ətrafında gedən döyüşlərdə fərqləndiyinə görə növbədənkənar mayor rütbəsi almışdır.

1994-cü ildən isə Pənah Məmmədov Tərtər rayon hərbi komissarı təyin olunmuş və 2003-cü il may ayının 1-nə qədər bu vəzifədə işləmişdir. Həmin vaxtdan bu günə kimi isə Mingəçevir Şəhər Hərbi Komissarlığında 3-cü Bölmənin rəisi işləyir.

Pənah Məmmədov xidmət etdiyi müddətdə «10 illik yubiley», «Qüsursuz xidmətə görə» medalları ilə təltif olunmuşdur.

Ailəlidir, Dilsuz və Pərviz adlı iki oğlu, Pünhanə adlı bir qızı var.





# Vətən sevgisi

Suliddin Bəhmən oğlu Yusibov 1964-cü il fevral ayının 1-də Tərtər rayonunun Səhlabad kəndində anadan olmuşdur.

Orta təhsilini Səhlabad kənd orta məktəbində almışdır.

1982-ci ildən 1984-cü ilə kimi Sovet Ordusu Sıralarında xidmət etmişdir. Hərbi xidmətdən qayıtdıqdan sonra iki il Mirbəşir Narçılıq Sovxozunda fəhlə işləmiş, 1986-cı ildən 1987-ci ilə kimi Bərdə rayonundakı texniki peşə məktəbində təhsil almış, avtoçilingər peşəsinə yiyələnmişdir.

1988-ci ildən Mingəçevir şəhərindəki 6 saylı Tikinti-Quraşdırma İdarəsində sürücü işləmişdir. 1990-cı ildə rayonumuza qayıdaraq burada fəaliyyət göstərən özünümüdafiə batalyonuna yazılmışdır.

1992-ci ildən 703 saylı hərbi hissənin 5-ci batalyonunun tərkibində torpaqlarımızın müdafiəsi uğrunda gedən döyüşlərdə iştirak etmişdir. Ağdərə rayonunun ərazisində, Marağa, Marquşevan, Sərsəng Su Anbarı, «Turbaza», «Ayı heykəli», Drambon, Çıldıran və Qızılqaya uğrunda gedən qanlı döyüşlərdə ön cərgələrdə olmuşdur.

1993-cü il fevral ayının 26-da «Platina»nın alınmasında xeyli erməni canlı qüvvəsini məhv edərək ağır yaralanmışdır.

1993-ci ilin may ayında II qrup Qarabağ Müharibəsi əlili statusu almasına baxmayaraq, 1994-cü ildə təkrarən «Tərtər-2» batalyonuna daxil olaraq yenə də döyüşmüşdür.

1994-cü ilin may ayında aldığı güllə yarasından səhhəti pisləşmiş və yenidən qospitala göndərilmişdir. Bundan sonra daha Suliddin Yusibova vuruşmağa icazə verməmişlər.

1997-ci ildən 2001-ci ilə kimi Tərtər Rayon Qarabağ Əlilləri Cəmiyyətinin sədri vəzifəsində çalışmışdır.

2005-ci ildən Qarabağ Əlilləri, Veteranları və Şəhid Ailələri İctimai Birliyi Tərtər Rayon Şöbəsinin sədri vəzifəsində işləyir.

Ailəlidir, 1 oğlu, 2 qızı var.

Hal-hazırda Tərtər şəhərində yaşayır.





# Müqəddəs döyüş yolu

Nizami Firudin oğlu Heydərov 1956-cı il aprel ayının 5-də Bərdə rayonunun Kətəlparaq kəndində anadan olub.

1972-ci ildə həmin kəndin orta məktəbini bitirmiş və Gəncə İnşaat Texnikumuna daxil olmuşdur.

1974-1976-cı illərdə hərbi xidmətdə olmuşdur. Hərbi xidmətdən sonra qayıdıb yenidən təhsilini davam etdirmişdir. Sonra istehsalatda çalışmışdır. Daha sonra gizir rütbəsilə hərbi təlim toplantılarına cəlb olunmuşdur, desant ordusunda təlim keçmişdir.

1992-ci ildə «Qurtuluş» batalyonunun tərkibində doğma yurdumuzun müdafiəsinə qalxmışdır. Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Marquşevan, Marağa, Həsənqaya, Çaylı, Ağdərə, Koçakod kəndləri uğrunda gedən döyüşlərdə igidliklər göstərmişdir.

1992-ci ilin sentyabr ayından «Tərtər» özünümüdafiə batalyonuna ərzaq xidməti rəisi təyin olunmuşdur. 1993-cü ilin yanvar ayından batalyon komandirinin döyüş işləri üzrə müavini

vəzifəsini daşımış, Milli Qəhrəman Elman Hüseynov həlak olduqdan sonra isə onun yerinə batalyonun komandiri təyin edilmişdir.

O vaxtlar Elman Hüseynovun qəhrəmancasına həlak olduğu «Qanlı təpə» deyilən ərazidə batalyonun 13 döyüşçüsünün meyidi qalmışdı. Nizami 100 nəfər döyüşçü ilə hücuma keçərək 2 aydan artıq müddət ərzində götürülə bilməyən döyüş dostlarının meyidlərini də götürmüş, üstəlik «Qanlı təpə»ni də almışdılar. Bu döyüşdə onlar düşmənin xeyli hərbi sursatını və silahını ələ keçirmişdilər.

Nizamiyə Azərbaycanın Milli Qəhrəmanları Vəzir Orucov və Elman Hüseynovla çiyin-çiyinə döyüşmək çox şey öyrətmişdi. O, Vətən uğrunda müqəddəs və həm də ağır döyüş yolları keçmişdir.

«Qlobus» yüksəkliyi uğrunda gedən vuruşmalarda Nizami Heydərov döyüşçü dostları ilə birlikdə şücaətlər göstərmiş, aprelin 2-də həmin strateji yüksəkliyi almışlar.

1993-cü il iyul ayının 23-də Nizami Heydərov Akopkamari uğrunda gedən döyüşlərdə ağır yaralanmış, ancaq sağalan kimi yenə cəbhəyə dönmüşdür. Səhhətinə görə onu arxa cəbhəyə göndərmişlər.

Nizaminin keçdiyi şərəfli döyüş yolu gənclərə bir örnək ola bilər. Onun cəbhədə göstərdiyi qəhrəmanlıqlar dövlətimiz tərəfindən yüksək qiymətləndirilmiş və Nizami Heydərov «Azərbaycan Bayrağı» ordeni ilə təltif olunmuşdur.

Hal-hazırda I qrup Qarabağ Müharibəsi əlilidir.

5 övladı var.

Tərtər şəhərində yaşayır.





# Cəsarət və mərdlik nümunəsi

İlham Abbas oğlu Mustafayev 1970-ci il sentyabrın 6-da Tərtər rayonunun Cəmilli kəndində anadan olub. Orta təhsilini həmin kənddə alıb. Moskva Yol İnstitutunda mühəndis ixtisasına yiyələnib. 1988-1990-cı illərdə Sovet ordusu sıralarında hərbi xidmətdə olub.

1991-ci ildə isə artıq öz doğma torpağının müdafiəsi üçün zərurət yarandıqda İlham tərəddüd etmədən könüllü olaraq «Tərtər» Özünümüdafiə Batalyonuna tərkibində saysız-hesabsız gərgin döyüşlərin ən fəal iştirakçılarından biri olub.

İlham Mustafayev Vəzir Orucovun ən yaxın silahdaşı kimi onunla birgə dəfələrlə düşmənin arxasına keçib və azğın ermənilərə yaxşı dərs verib.

1991-ci ildən 1995-ci ilə qədər dinclik nə olduğunu bilməyən, sözün əsl mənasında qəhrəmanlıqlarla dolu döyüş yolu keçən İlham, elə bu gün də öz mərdliyi, cəsarəti, hadisələrə öz fərdi baxışı, namərd düşmənlərə və onlardan da namərd olan «sapı özümüzdən olan baltalar»a nifrəti ilə seçilir.

Ailəlidir, 2 övladı var. Hal-hazırda Cəmilli kəndində yaşayır.



# Xeyirxah insan

Malik Ələkbər oğlu Orucov 1969-cu il aprel ayının 14-də Tərtər rayonunun Hacıqərvənd kəndində anadan olmuşdur.

İlk təhsilini doğma kəndlərində almışdır. 1986-cı ildə isə Bakı şəhərində kimya-biologiya təmayüllü orta məktəbi bitirmişdir.

Uşaqlıqdan əsgərliyə həyat məktəbi kimi baxan Malik 1987-ci ildə hərbi xidmətə – Vətən qarşısında öz borcunu yerinə yetirməyə yola düşmüşdü. 1989-cu ildə ordu sıralarından tərxis olunmuşdu.

1990-cı ildə Azərbaycan Kənd Təsərrüfatı Akademiyasına daxil olmuşdu.

Mənfur ermənilər torpaqlarımıza basqın edəndə o da 1992-ci ilin əvvəllərində könüllü olaraq «Tərtər» Özünümüdafiə Batalyonuna yazılmış, yüzlərlə vətən oğlu kimi silaha sarılaraq canından da artıq sevdiyi el-obası, torpağı uğrunda döyüşlərə qatılmışdır.

1992-ci il aprel ayının 12-də ağır yaralanmış, sağ qolunu və ayağını itirmişdir.

I qrup əlil olsa da, Malik müharibədən sonra ikinci ali təhsil də almışdı – 2002-ci ildə Bakı Dövlət Universitetinin hüquq fakültəsini bitirmişdi.



Ailəlidir, iki oğlu, bir qızı var.

Hazırda Bakı şəhərində yaşayır.

Respublikamızda əlillər cəmiyyətinin yaradılmasında Malikin müstəsna xidmətləri olub.

Malik Orucov 1994-cü ildən indiyədək Əlillərin Sosial Müdafiəsi Baş İdarəsinin 5 saylı Zonasının rəisi vəzifəsində işləyir.

O, əlilliyin həyatda nə olduğunu çox yaxşı bilir. Buna görə də öz əlil yoldaşlarının dərd-sərinə daim şərik olur, onlara əlindən gələn maddi və mənəvi köməkliyi əsirgəmir, ondan nəsə uman insanların heç birini naümid yola salmır.



# Adı kimi etibarlı oğul

Etibar Zahid oğlu Qasımov 1969-cu il noyabr ayının 24-də Tərtər rayonunun Qaradağlı kəndində anadan olmuşdur.

Adı kimi özü də vətənə sədaqət, etibar ruhunda böyümüş, dar günündə ona dayaq olmağa çalışmış, silaha sarılıb öz doğma el-obasını qorumuşdu.

Etibar orta təhsilini Qarabağın gözü olan Qalada – Şuşa şəhərindəki 2 saylı riyaziyyat təmayüllü məktəbdə almışdır.

1989-1991-ci illərdə Rusiyanın Orenburq şəhərində hərbi xidmətdə olmuşdur.

1992-ci ildə könüllü olaraq cəbhəyə getmiş, Qarabağ Müharibəsində bir cəsur oğul kimi iştirak etmişdir. İki dəfə yaralanmasına baxmayaraq, döyüş yoldaşlarından ayrılmamış, sağalar-sağalmaz yenidən döyüşə qayıtmışdır.

1993-cü ildə Ağdərə Polis Şöbəsinə işə göndərilmişdir.

1994-cü ildə döyüşdə başından ağır yaralanmış, daha müharibədə iştirak edə bilməmişdir.

2000-ci ildə Xocalı rayon Polis Şöbəsinə işə göndərilmişdir.

2005-ci ildə təqaüdə çıxmışdır.

Ailəlidir, hazırda Tərtər şəhərində yaşayır.





# Mübariz döyüşçü

Mübariz Surxay oğlu Cəfərov 1971-ci il avqust ayının 25-də Tərtər rayonunun İsmayılbəyli kəndində dünyaya göz açmışdır. Böyüyüb boya-başa çatdığı kənddə orta məktəbi bitirən Mübariz 1989-1991-ci illərdə Novosibirskidə hərbi xidmətdə olmuşdur.

Vətənin ağır günündə ona dayaq olmaq, torpağımızın hər qarışı uğrunda mübarizə aparmaq üçün 1992-ci ildə Qarabağ Müharibəsinə qatılmışdır. Ağdərə istiqamətində gedən döyüşlərdə mərdlik və qorxmazlıq göstərmişdir. Ancaq 1992-ci ilin avqust ayının 27-də Drambon uğrunda gedən vuruşmaların birində, hücum əməliyyatı zamanı ayağından və qarın nahiyəsindən ağır yaralanmışdır. Bakı şəhərində, qospitalda müalicə olunsa da sağlamlığı tam bərpa edilməmişdir.

1993-cü ilin fevral ayında ordudan tərxis olunub.

II qrup Qarabağ Müharibəsi əlilidir.



# Düşmənlə üz-üzə

Firdovsi Səfqulu oğlu Əliyev 1973-cü il mart ayının 25-də Tərtər rayonunun Sarıcalı kəndində anadan olmuşdur. 1992-ci ildə 96 saylı Texniki Peşə Məktəbini bitirmiş, sonra Azərbaycan Ordusuna hərbi xidmətə çağırılmışdır. Əsgərlik həyatına Azərbaycanın qədim və doğma diyarı olan Naxçıvanda başlamışdır. Bir qədər sonra onu öz doğma şəhəri Tərtərdə hərbi xidmətini davam etdirməyə göndərmişlər.

Yüzlərlə tərtərli gənc kimi Firdovsi də silaha sarılmış, erməni quldurları ilə Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmiş və döyüşçü dostları ilə birlikdə düşmənin Tərtər torpağına ayaq basmasına imkan verməmişdir.

1994-cü ilin yanvar ayında Madagiz kəndi uğrunda gedən döyüşdə xeyli qəlpə yarası almış və Bakıya müalicəyə göndərilmişdir. 1994-cü ilin iyul ayında isə ordudan tərxis olunmuşdur.

Firdovsi II qrup Qarabağ Müharibəsi əlildir.

Ailəlidir, 2 övladı var.

Hal-hazırda böyüyüb boya-başa çatdığı Sarıcalı kəndində yaşayır.





# Ön cəbhədə vuruşmuşdur

Elşad Fərman oğlu Babayev 1967-ci ilin payızında dünyaya göz açmışdır. Şəhər 1 saylı orta məktəbin səkkizinci sinfini bitirdikdən sonra təhsilini 96 saylı Texniki Peşə Məktəbində davam etdirmişdir. 1986-cı ildə peşə təhsilindən sonra hərbi xidmətə çağrılmışdır. İki il Amur Vilayətində əsgərlik çəkmişdir. Ordu sıralarında xidmət etmək ona nizam-intizam, möhkəm iradə, çeviklik, cəsarət öyrətmişdi.

Torpaqlarımızın başı üzərini qara buludlar alanda, könüllü olaraq «Tərtər-1» batalyonuna yazılıb, doğma yurdun müdafiəsinə qalxmışdır. Elşad Qarabağ Müharibəsində – Ağdərə istiqamətindəki döyüşlərdə iştirak etmiş, iki il ön cəbhədə vuruşmuşdur.

1992-ci ildə Sərsəng gölü ətrafında gedən döyüşlərdə yaralanaraq ordudan tərxis olunmuşdur.

O, II qrup Qarabağ Müharibəsi əlilidir.

1998-ci ilə qədər rayon polis şöbəsində işləmişdir.

Ailəlidir, iki övladı var.



# Əsgər olmaq arzusu

Ədalət Qurban oğlu Şərifov 1961-ci ildə Tərtər şəhərində fəhlə ailəsində dünyaya göz açmışdır.

1978-ci ildə şəhər 1 saylı orta məktəbini bitirmiş, elə həmin il də Elektromexanika zavodunda tornaçı peşəsinə yiyələnmişdir.

Hələ uşaqlıqdan əsgər paltarında olanlara böyük həsədlə baxan Ədalət, nəhayət, 1980-cı ildə öz arzusuna qovuşmuşdu. Və həmin gün özünü vətəninə, elinə daha gərəkli, lazımlı insan kimi hiss etmişdi. Hərbi xidmət onu ciddiləşdirmiş, dəqiq nizam-intizam öyrətmişdir. Əsgərlikdən sonra yenidən əvvəllər işlədiyi zavoda – öz işinə dönmüş və 1991-ci ilə qədər orada işləmişdir. 1991-ci ildən isə işini Tərtər rayon Polis Şöbəsinə dəyişmişdir, post-patrul xidmətində polis çavuşu vəzifəsində çalışmışdır.

Ədalət də digər tay-tuşları kimi vətən torpağını müdafiə etmək üçün Qaradağ savaşına qoşulmuş və bir sıra vuruşmaların iştirakçısı olmuşdur.

1999-cü ildən təqaüddədir.

Ailəlidir, iki övladı var.

Hazırda Tərtər şəhərində yaşayır.





# Əsl vətəndaş

İlham İbrahim oğlu Məmmədov 1966-cı ilin mart ayının 4-də Tərtər rayonunun İrəvanlı kəndində dünyaya göz açıb. Bəlkə də onun gəlişi təbiətin oyandığı, gül-çiçəyin açdığı, ilhamlı bir vaxta düşdüyü üçün adını İlham qoyublar? İlham da böyüdükcə vətəninə, onu boya-başa çatdıran torpağına daha qırılmaz tellərlə bağlanıb.

İlham Söylən kənd orta məktəbini bitirdikdən sonra 1984-1986-cı illərdə hərbi xidmətdə olub. Əsgərlikdən sonra əvvəlcə kolxozda fəhlə, sonra isə rayon polis şöbəsinin post-patrul xidmətində işləmişdir.

İlham Qarabağ Müharibəsində düşmənlərə qarşı mərdliklə vuruşmuşdur.

Marquşevan ətrafında mina partlayışı nəticəsində baş nahiyyəsindən ağır yaralanmışdır.

II qrup Qarabağ Müharibəsi əlilidir. Hazırda Tərtər rayonunun İrəvanlı kəndində yaşayır.

Ailəlidir, 2 övladı var.



# İkinci həyat

İlyas Cəbrayıl oğlu Şəmilov 1974-cü ildə Tərtər rayonunun Buruc kəndində anadan olub.

1992-ci ilin əvvəllərində orduya çağrılıb. Şəmkir rayonunda 3 ay hərbi təlim keçdikdən sonra Tərtər-Ağdərə döyüş bölgəsinə göndərilib.

İlyas indi ikinci həyatını yaşayır.

O, 1993-cü ilin mart ayında Murov dağının ətrafındakı döyüşlərdə iştirak edir. Orada sağ ayağını don vurur. Beş gün Toğanada müalicə aldıqdan sonra yenidən döyüşə qayıdır. Həmin ilin may ayının 25-də hücum zamanı snayper gülləsilə sol gözündən yaralanır.

Onu yenə Toğana kəndinə gətirirlər. İlyası orda ölmüş bilib, Gəncəyə göndərirlər. Gəncədə döyüşçü yoldaşı Sərxan Həsənov İlyasın nəfəs aldığını görüb atası ilə birlikdə həkimə xəbər vermiş və onu təcili cərrahi əməliyyata götürmüşlər. Bir neçə saatlıq əməliyyatdan sonra gülləni çıxara bilmişlər. Lakin vəziyyəti ağır olduğu üçün İlyası vertalyotla Bakıya yola salmışlar. Dörd dəfə aparılan ağır cərrahiyyə əməliyyatlarından sonra o, sol gözünü



tamamilə itirmiş, sağ gözünün görməsi isə 80 faizə enmişdir.

Bununla da onun döyüşçü həyatına son qoyulmuş və bir daha müharibədə iştirak edə bilməmişdir.

Hal-hazırda II qrup əlildir. Hazırda Tərtər rayonunun Buruc kəndində yaşayır.

İlyas Şəmilov 1995-ci ildə ailə həyatı qurmuşdur, iki övladı var.



# Ağır döyüşlərin iştirakçısı

Rəsul Məhərrəm oğlu Məmmədov 23 iyul 1970-ci ildə Tərtər rayonunun İrəvanlı kəndində anadan olmuşdur.

1986-cı ildə Söylən kənd orta məktəbini bitirmişdir.

1988-1990-cı illərdə hərbi xidmət keçmişdir. Əsgərlik həyatı onun gələcək iş yerini də müəyyənləşdirmişdir. Komandanlığın göndərişilə Tərtər Rayon Polis Şöbəsinə işə qəbul edilmişdir.

1990-1994-cü illərdə Tərtər–Ağdərə istiqamətində gedən bir çox ağır döyüşlərdə yaxından iştirak etmişdir.

1994-cü ildə isə Ağdərə ətrafında ağır yaralanaraq kəllə-beyin travması almış və ordudan tərxis olunmuşdur.

2000-ci ildən II qrup əlildir.

Rəsul hazırda Tərtər rayonunun İrəvanlı kəndində yaşayır.

Ailəlidir, 2 övladı var.





# Qardaşlarını da əvəz etmişdir

Pərviz Nəriman oğlu Mehdiyev 1967-ci il dekabr ayının 6-da Tərtərdə dünyaya göz açmışdır.

Səkkizillik təhsilini şəhər 3 saylı əsas məktəbdə başa vurduqdan sonra 96 saylı Texniki Peşə Məktəbində ekskavatorçu – maşınçı sənətinə yiyələnmişdir.

1985-1987-ci illərdə hərbi xidmətdə olmuşdur.

1990-cı ildə xain ermənilərin nankorluğuna cavab vermək üçün qardaşları Elman və Telmanla birgə könüllü olaraq cəbhəyə getmişdir.

Pərviz, Aslan Kərimovun rəhbərlik etdiyi batalyonda kəşfiyyat qrupunun tərkibində vuruşmağa başlamışdı. O bir sıra döyüş əməliyyatlarında iştirak etmişdi.

Qardaşı Elman Həsənqaya istiqamətində gedən döyüşlərin birində şəhidlik zirvəsinə ucalmışdı. Digər qardaşı Telman isə Çardaxlı istiqamətində gedən döyüşlərdə yaralanaraq I qrup əlil olmuşdur.

Pərviz bundan sonra döyüşlərdə daha çox şücaət göstərmiş,

qardaşlarının intiqamını almaq üçün yağılara aman verməmişdir. O, Tərtər-Kəlbəcər istiqamətində gedən bütün ağır döyüşlərdə iştirak etmişdir. Drambon ətrafındakı vuruşmada mühasirəyə düşən yoldaşları Şahbaz, İlham, Vidadi, Elçin və Elşad onun köməkliyilə xilas olmuşlar. Pərviz döyüşlərdə öz cəsarətilə həmişə fərqlənmişdir.

Axırıncı döyüşü isə 1994-cü il may ayında Qırmızıkənd istiqamətində, Tərtərin Qapanlı kəndinə ermənilərin hücumu zamanı olmuşdur.





# Vətənə bağlı oğul

Misir Qardaşxan oğlu Ağayev 1966-cı ildə Tərtər rayonunun İsmayılbəyli kəndində anadan olmuşdur. 1983-cü ildə həmin kəndin orta məktəbini bitirmişdir.

Misir 1984-cü ildə hərbi xidmətə çağırılmış, 1986-cı ilə kimi vətən qarşısında öz borcunu ödəmişdir. Əsgəri xidmətdən sonra o çoxdan bəri arzusunda olduğu sürücülük peşəsinə yiyələnmişdir.

Ürəyində vətən sevgisi olan, öz elinin, obasının qədrini bilən bütün azəri oğulları kimi o da 1993-cü ildə könüllü olaraq Qarabağ savaşına qoşuldu və bir çox döyüş əməliyyatlarında iştirak etdi. 1994-cü ilin yanvar ayının 6-da ağır yaralandı. Ürəyi cəbhə dostlarının yanında qalsa da, səhhəti döyüşlərdə iştirak etməyə yol vermədi, ordudan tərxis olundu.

Misir ailəlidir, 3 övladı var.

II qrup Qarabağ Müharibəsi əlilidir.



# Ata-oğul döyüş dostu olublar

Qabil Sabir oğlu Köçərli 1957-ci il aprel ayının 1-də Tərtər şəhərində doğulmuşdur.

Orta təhsilini Səhlabad kənd orta məktəbində almışdır.

1975-1977-ci illərdə Rusiyada hərbi xidmətdə olmuşdur.

Əmək fəaliyyətinin xeyli hissəsi tikinti ilə bağlıdır.

1990-cı ildən Qarabağ Müharibəsində iştirak edib. 1993-cü ildən isə 16 yaşlı oğlu İlqar da atasıyla birgə döyüşlərə qatılıb. Oğul atadan güc alıb, ata oğula arxa, kömək olub. Hər ikisi doğma torpağı göz bəbəkləri kimi qoruyublar. Ağdərə istiqamətində gedən bütün ağır döyüş əməliyyatlarında iştirak ediblər. Qabil dəfələrlə yüngül yaralanıb. 1995-ci ildə ordudan tərxis olunub.

Oğlu İlqar isə ağır yaralandıqdan sonra daha döyüşlərdə iştirak edə bilməyib. O, II qrup Qarabağ Müharibəsi əlilidir.

Onlar həm ata-oğul, həm də cəbhə dostudurlar.

Qabil Köçərli artıq babadır, 3 övladı, 5 nəvəsi var.

Hərdən ata-bala körpələri başlarına yığıb cəbhə xatirələrindən danışırlar.





# Nağı öz vətənini qoruyurdu

Nağı Ağalar oğlu Teymurov 1968-ci il iyul ayının 14-də Tərtər rayonunun Kəngərli kəndində anadan olub.

Atası Ağalar kişi II qrup Böyük Vətən Müharibəsi əlili idi.

Nağının xəyalına da gəlməzdi ki, o da atası kimi cəbhədə vuruşacaq, vətən torpağının təcavüzkarlardan təmizlənməsində iştirak edəcək və elə atası kimi də II qrup əlil olacaqdı.

Hələ bunlara neçə illər var idi. Bu illər ərzində Nağı orta məktəbi bitirdi, peşə məktəbində ixtisas aldı. Hərbi xidmətini isə 1986-1988-ci illərdə Rusiyanın Cita Vilayətində başa vurdu.

1993-cü ildən Ağdərə istiqamətində ge-dən döyüşlərdə iştirak etdi. Müharibə onun da sağlamlığını əlindən aldı – sinəsindən yaralandı.

1996-cı ildə II qrup əlil kimi ordudan tərxis olundu.

Ailəlidir, 2 övladı var.

Hazırda Tərtər rayonunun Kəngərli kəndində yaşayır.



# İgid Vətən oğlu

Elxan Fazil oğlu İbadov 1968-ci il martın 6-da anadan olmuşdur.

Təhsilini Tərtər şəhər 3 saylı orta məktəbdə almışdır. Əsgəri borcunu 1986-88-ci illərdə Qazaxıstanda ödəmişdir. Sonra Tərtərdə elektromexanika zavodunda tornaçı işləmişdir.

Elxan 1991-ci ildə könüllü olaraq cəbhəyə getmiş, Marquşevan, Marağa, Ağdərə, Çaylı döyüşlərində qorxmaz bir oğul kimi iştirak etmişdir.

1993-cü ilin dekabr ayının 28-də Lüləsaz uğrunda gedən vuruşmada sağ qolundan ağır yaralanan Elxan xeyli vaxt Gəncə hərbi qospitalında müalicə olunmuşdur.

1994-cü ildə ordudan tərxis edilmişdir.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, 2 övladı var.

Hazırda Tərtər şəhərində yaşayır.





# Qanun keşikçisi cəbhədə

Köçəri Qulu oğlu Əliyev 1954-cü il iyun ayının 15-də Tərtər rayonunun Düyərli kəndində anadan olmuşdur.

1971-ci ildə Səhlabad kənd orta məktəbini bitirərək, təhsilini Bərdədəki texniki peşə məktəbində davam etdirmişdir.

1973-1975-ci illərdə Rusiyanın Arxangelski vilayətində hərbi xidmətdə olmuşdur.

1977-ci ilin yanvarından Tərtər rayon Daxili İşlər Şöbəsinin nəzdində mühafizə bölməsində milis nəfəri işləmişdir. Yaxşı işinə görə «Milis əlaçısı» döş nişanı alıb.

Köçəri Əliyev öz milis yoldaşları ilə birgə Ağdərə istiqamətində gedən döyüşlərdə yaxından iştirak edib.

1994-cü ilin fevral ayının 2-də hərbi xidmət tapşırığını yerinə yetirərkən sol gözündən yaralanıb.

1995-ci il aprel ayının 5-dən təqaüdə çıxıb.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, 2 övladı var.



# Müəllim döyüşçü

Bayram Qiyas oğlu İbrahimov 1958-ci ildə Tərtər rayonunun Səhlabad kəndində anadan olmuşdur. Səhlabad kənd orta məktəbini bitirdikdən sonra V. İ. Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunda təhsil almışdır.

1993-cü ildə könüllü olaraq döyüşlərə qatılmışdır. Ağdərə istiqamətində gedən bütün döyüşlərdə fəal iştirak etmiş, Həsənqayanın, Maralyanın, Madagizin, Akop Kamarinin, Çardaxlının düşmənlərdən təmizlənməsində şücaətlər göstərmişdir. 1994-cü il yanvarın 1-də «Hərbi xidmətlərə görə» medalı ilə təltif olunmuşdur. 1994-cü ildə Ağdərə ətrafında gedən vuruşmalarda yaralanmışdır.

II qrup Qarabağ Müharibəsi əlilidir.

2003-cü ildən Tərtər rayonu Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzində direktor vəzifəsində çalışır.

Ailəlidir, 3 oğlu, 1 qızı var.

Hazırda Tərtər rayonunun Səhlabad kəndində yaşayır.





# Vətən qarşısında üzü ağdır

Nizami Fərhad oğlu Bərdari 26 dekabr 1968-ci ildə Tərtərdə anadan olub. Orta təhsilini Səhlabad kənd orta məktəbində almışdır.

Nizami hərbi xidmətini Rusiyanın Sank-Peterburq şəhərində başa vuraraq vətənə dönmüşdür. Bu, o vaxtlar idi ki, Tərtər rayonu hər gün düşmənin hücumuna, atəşinə məruz qalırdı.

Nizami də doğma yurdun müdafiəsi üçün silaha sarılaraq yağı düşmənlərlə döyüşə getdi. Tərtər bölgəsində Torpaqtəpə, Çaylı, Orta kəndin azad olunması uğrunda aparılan döyüşlərdən tutmuş Laçın, Qubadlı ərazilərində gedən vuruşlara kimi iştirak etdi. 1994-ci il yanvar ayının 26-da hərbi əməliyyat zamanı minaya düşərək, sağ ayağını itirmişdir.

1994-cü ilin avqust ayından ordudan tərxis olunmuşdur.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, üç qızı, bir oğlu var.

Cismən əlil olsa da, həm vətən, həm övladları qarşısında alnıaçıq, üzüağdır.



# Həyat məktəbi

Elçin Mahmud oğlu Məmmədov 1970-ci il iyulun 2-də Tərtər şəhərində anadan olmuşdur.

96 saylı Texniki Peşə Məktəbini bitirdikdən sonra hərbi xidmətə getmişdir. Əsgərlik ona çox şey öyrətmişdi. Nizam–intizam, möhkəm iradə, dönməzlik, vətən torpağına bağlılıq. Orada öyrəndikləri Qarabağ Müharibəsində gərəyi olmuş, erməni daşnaklarına layiqli cavab verməkdə köməyinə çatmışdı.

Drambon uğrunda gedən döyüşlərin birində ağır yaralanmışdır.

Müharibədə bərkə-boşa düşməklə o böyük bir həyat məktəbi keçmişdir.

Hal-hazırda III qrup Qarabağ Müharibəsi əlilidir.





# Ən böyük borc

Müharibə dəhşətdir. O, bəşər övladı üçün yalnız və yalnız bədbəxtlik gətirir.

İnsana ömür bir dəfə verilirsə, bu zaman kəsiyini nəyə görə keşməkeşlərdə, əzab, dərd, qəm-qüssə içində keçirməlidir ki ?

İllər boyu bədnam qonşularımız olan ermənilər biz azərbaycanlıları davaya sürükləyib, qan töküb, düşmənçilik toxumu səpiblər. Zaman-zaman bizim doğma dədə-baba torpaqlarımızı zor-xoş əlimizdən müxtəlif vasitələrlə ala-ala özləri üçün bir Ermənistan yaradıblar. İndi də «Böyük Ermənistan» yaratmaq istəyirlər.

Şirin Əhməd oğlu Xəliliov 1955-ci ilin avqust ayında anadan olmuşdur. Orta təhsil illərindən sonra, 1975-ci ildə ordu sıralarına çağrılmışdı. O, Vətən torpaqlarını xain erməni quldurlarından qorumağı özünün ən böyük borcu hesab edirdi.

Qarabağ Müharibəsi başlayanda döyüşlərə qatılmış və bir çox vuruşmalarda fəal iştirak etmişdi.

1993-cü ildə isə Ağdərə istiqamətində gedən döyüşlərdə kantuziya almış və ordudan tərxis olunmuşdur.



# Gərəkli insan

İnfil Aslan oğlu Məmmədov 1965-ci ildə Tərtər rayonunun Hacıqərvənd kəndində anadan olmuşdur.

Orta təhsilini böyüyüb böya-başa çatdığı həmin kənddə almışdır.

1984-1986-cı illərdə Rusiyanın Ulan-Ude şəhərində hərbi xidmət keçmişdir. Əsgərlikdən sonra Tərtər rayon Hava Məlumat Bürosunda işləmişdir.

1993-cü ilin aprel ayından isə Qarabağ savaşına qatılmışdır. Tərtər-Ağdərə istiqamətində, Talış, Donaşen, Çardaxlı, Dəstəgül və sair kəndlər uğrunda gedən döyüşlərdə iştirak etmişdir.

1993-cü il iyul ayının 23-də Lüləsaz ətrafındakı vuruşmalarda sağ budundan güllə yarası almışdır. Həmin ilin dekabr ayında ordudan tərxis olunmuşdur.

Hal-hazırda II qrup Qarabağ Müharibəsi əlilidir.

3 övladı var – İlkin, Elçin və Sona. Xoşbəxt bir atadır, vətəninə də, ailəsinə gərəkli bir insandır.

Tərtər rayonunun Hacıqərvənd kəndində yaşayır.





# Qorxmazlıq

Vidadi Rəhim oğlu Hüseynov orta təhsilini doğulub boya-başa çatdığı Hacıqərvənd kənd məktəbində alıb.

1991-ci ildə ordu sıralarına çağrılıb. Çelyabinski şəhərində cəmi üç aylıq hərbi xidmətdən sonra vətənə dönüb. Tərtər-Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak edib.

1992-ci ilin fevral ayından tibbi rotada sürücü işləyib. Sonra piyada qoşunlarda əsgəri xidmətini davam etdirib. Kasabet, «Platina», Lüləsaz, Donaşen, Qəhrilər uğrunda gedən döyüşlərdə qorxmazlıq göstərib.

1994-cü ildə Lüləsaz kəndi ətrafında yaralanıb. Həmin ili də ordudan tərxis olunub.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Şamil və Ramil adlı iki oğlu var. İnanırıq ki, onlar da ataları kimi doğma yurd-yuvalarını ürəkdən sevəcək və göz bəbəkləri kimi qoruyacaqlar.



# Həyatla qovğa

İlqar Abbas oğlu Hüseynov II qrup Qarabağ Müharibəsi əlilidir. Cismən əlillik dərd deyil, vay o günə ki, insan mənən əlil ola! Bax, əsil faciə budur.

İlqar isə öz əlilliyilə fəxr etməlidir. Çünki canından əziz sandığı vətəni üçün canına qıymışdır.

Müharibədə iştirak etmək, vətən uğrunda ölümün gözlərinin içinə düz baxmaq hər oğulun işi deyil. İlqar öz elinə, öz yurduna belə igid oğul olmuşdur.

1974-cü ildə Seydimli kəndində dünyaya göz açan İlqar orta təhsilini elə həmin kənddə başa vurduqdan sonra hərbi xidmətə yola düşmüşdür. Xidməti vəzifəsini yerinə yetirərkən, 1994-cü il aprel ayının 18-də Ağdam rayonunun Güllücə kəndi uğrunda gedən döyüşlərdə ağır yaralanmışdı.

Hazırda II qrup Qarabağ Müharibəsi əlili kimi həyatla qovğadadır.





# Vəzirin silahdaşı

Ədalət Novruz oğlu Dadaşov 1971-ci ildə Tərtər rayonunun Söylən kəndində anadan olub.

Orta məktəbi bitirdikdən sonra ordu sıralarına çağırılıb. Əsgərlik xidmətini bitirdikdən sonra «Tərtər» batalyonunda Milli Qəhrəman Vəzir Orucovla birgə Qarabağ uğrunda gedən döyüşlərə qoşulub. Vəzirlə çiyin-çiyinə müharibədə iştirak etməsi ona çox şey öyrədib, mərdlik, qorxmazlıq dərsi keçib. Son tikəsini belə döyüş dostları ilə bölüb.

1992-ci ilin sentyabr ayının 1-də Drambon kəndi uğrunda gedən döyüşlərdə ağır yaralanıb.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Ədalət ailəlidir, Kamilə adlı bir qızı, Səxavət və Eltun adlı iki oğlu var.

Hazırda Tərtər rayonunun Söylən kəndində yaşayır.



# Alnıaçıqlıq

Vidadi Mürşüd oğlu Məmmədov 1970-ci ildə bir gözəl yaz səhərində dünyaya göz açıbdı. Bəlkə də ona görə təbiəti, onun gözəlliklərini, «cənnət məkan» Qarabağı daha böyük məhəbbətlə sevib. Böyüyüb boy atdığı Tərtərin hər qarış torpağına vurulub. Vətəni sevməyi, «vətən daşı» olmağı orta təhsil aldığı şəhər 1 saylı məktəbində müəllimlərindən öyrənib.

Böyük həvəslə 1988-ci ilin may ayında hərbi xidmətə yola düşüb. Ordu sıraları Vidadi üçün «kişilik məktəbi» olub, bərkə-boşa düşüb. 1990-cı ildə hərbi xidmətdən geri dönüb.

Hələ uşaqlıqdan ürəyində gəzdirdiyi arzusuna qovuşub. Doğma rayonunda milis nəfəri kimi işə qəbul edilib.

Həmin illər Tərtər çox ağır günlər yaşayırdı. Həm «Tərtər» batalyonu, həm milis dəstələri döyüşlərdə iştirak edir, düşmənə layiqli cavab verirdilər. Vidadi də öz milis yoldaşları ilə birgə Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak edirdi.

1992-ci ildə Ağdərə rayonunun Marquşevan (indiki Şıxarx) kəndi uğrunda gedən döyüşlərdə ağır yaralandı…

İndi Vidadi Məmmədov II qrup Qarabağ Müharibəsi əlili olsa da, vətən qarşısında başı ucadır.





# Həcər qeyrətli qadınlarımız

Məryəm Nəbi qızı Qarayeva 1952-ci ildə Kəlbəcər rayonunun Çaykənd kəndində anadan olmuşdur.

1993-cü ildə Kəlbəcərin işğalından sonra Məryəm ailəsi ilə birgə Tərtər şəhərinə pənah gətirmiş və burada müvəqqəti məskunlaşmışdılar.

Qaniçən düşmənə qarşı ürəyində hədsiz kini, nifrəti olan Məryəm döyüşən ordumuza kömək etməyi qarşısına məqsəd qoymuşdur. Döyüş zonasından yaralı əsgərlərimizin çıxarılmasında və onlara tibbi yardım göstərilməsində qızı Səadətlə birgə böyük hünər göstərmişdir.

1994-cü ilin mart ayında isə xidməti vəzifə borcunu yerinə yetirərkən yaralanmış və II qrup əlil olmuşdur. O, baş çavuş rütbəsində ordudan tərxis edilmişdir.

Qızı Səadət də Qarabağ Müharibəsi veteranıdır.

Hazırda Məryəm Qarayeva Tərtər şəhərində yaşayır, 4 övladı, 5 nəvəsi var.



# Böyük iradə sahibi

Əliyar Bəhlul oğlu Cəfərov 1974-cü il iyul ayının 24-də Tərtər rayonunun Hüsənli kəndində anadan olmuşdur.

Adını Əliyar qoyan valdeynləri ona Həzrəti Əlinin yar olacağına, onu qoruyacağına inanmışdılar.

Əliyar 1991-ci ildə orta məktəbi bitirmişdir.

1992-ci ildə Azərbaycan Ordusuna həqiqi hərbi xidmətə çağırılmış, 1997-ci ildə tərxis olunmuşdur.

«Tərtər Ərazi Özünümüdafiə Batalyonu»nun tərkibində erməni quldurlarına qarşı gedən bir çox ağır döyüşlərdə iştirak etmişdir. Ağdərə, Ortakənd, Çardaxlı, Lüləsaz, Donaşen, Drambon, Talış, Çaylı, «Qlobus» yüksəkliyi, 3№-li sovxoz, Qırmızıkənd, Qapanlı istiqamətlərində aparılan ağır vuruşmalar onun cəbhə xatirələrində dərin iz buraxmışdır.

1993-cü il  iyunun 13-də Lüləsaz uğrunda gedən döyüşdə ağır yaralanmış, ermənilərin ərazisində qalmışdır. Bütün iradəsini toplayaraq, sürünüb öz ərazimizə keçmiş, beləliklə də əsir düşmək təhlükəsindən qurtarmışdır.

Hazırda III qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, iki övladı var.





# Cəbhə kişilik meydanıdır

Mətləb Əziz oğlu Manafov 1958-ci ilin payızında dünyaya gəlib. Tərtər rayonunun Səhlabad kəndində ilk addımlarını atıb, burada əlinə çanta alıb məktəbə gedib.

Orta təhsil illərindən sonra Rusiyanın Çita Vilayətində hərbi xidmətdə olub. Xidmətdən sonra Tərtər rayon Subartezian İdarəsində işləməyə başlayıb.

1992-ci ilin avqust ayında könüllü olaraq cəbhəyə yollanıb. Ağdərə istiqamətində «Tərtər» batalyonunun tərkibində döyüşüb. Bir neçə dəfə yaralanmasına baxmayaraq, savaş meydanını tərk etməyib.

1993-cü ildə isə ağır yaralandığı üçün ordudan tərxis olunub.

Ailəlidir, 1 oğlu var, 2 qızı var.

Hazırda Tərtər rayonunun Səhlabad kəndində yaşayır. Cəbhəni «kişilik meydanı» adlandırır.



# Ən böyük arzu

Hafiz Məhiyyədin oğlu Mirzəyev 1974-cü il aprel ayının 11-də Tərtər şəhərinin Hüsənli kəndində anadan olmuşdur. 1991-ci ildə orta məktəbi bitirmiş, 1992-ci ildə hərbi xidmətə çağrılmışdır. Kasapet, Nərgiztəpə, Qarakənd, Qızılqaya, Şişqaya və Fizuli istiqamətində gedən döyüşlərdə iştirak etmişdir.

Son döyüşünü 1994-cü il yanvar ayının 27-də keçirmişdir. Şişqaya uğrunda gedən qızğın vuruşmada ağır yaralanmış, II qrup əlil olmuşdur.

Onun ən böyük arzusu doğma torpaqlarımızı işğaldan azad, və bütöv görməkdir.





# Döyüş dostlarından ayrılmaq istəmirdi

Seymur Əli oğlu Abbasov 1967-ci ildə Tərtər rayonunun Evoğlu kəndində anadan olmuşdur. Həmin kənddə orta məktəbi bitirdikdən sonra hərbi xidmətə getmiş, iki il Almaniya Demokratik Respublikasında əsgərlik borcunu yerinə yetirmişdir.

Hərbi xidmətdən sonra Tərtər rayonunda sürücü işləmişdir.

1993-cü ildə isə könüllü olaraq cəbhəyə yollanmış, Ağdərə istiqamətində gedən ağır döyüşlərdə iştirak etmişdir.

Həmin ilin sentyabr ayının 26-da Levonarx kəndinə hücum zamanı sol qolundan yaralanmışdır. Beləliklə də ürəyi döyüş yoldaşlarının yanında qalsa da, 1994-cü ildə səhhətinə görə onlardan ayrılmağa məcbur olmuşdur.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Subaydır.

Hazırda Tərtər rayonunun Evoğlu kəndində yaşayır.



# Onun həyat amalı

Nurəddin Əmiraslan oğlu Hümbətovun 45 yaşı var. O Tərtərdə anadan olub. Onun üçün öz həyatindən, küçəsindən, başlayan Vətəninin torpağı da, daşı da əziz idi.

Təhsilini şəhər 4 saylı səkkizillik məktəbində başa vurduqdan sonra şəhər 6 saylı orta məktəbi bitirib.

Öncə Vətən qarşısında borcunu verməyə yola düşdü, 1980-1982-ci illərdə hərbi xidmətdə oldu. Ömrünün altı ilini (1983-1989) Rusiyanın Boloqda şəhərində kərpic zavodunda keçirdi. Sonra: «Gəzməyə qərib ölkə, ölməyə Vətən yaxşı»– deyib, doğma yurdu Tərtərə döndü. Əvvəlcə 41 saylı Mexanikləşdirilmiş Dəstədə fəhlə işlədi. Sonra Tərtər rayon DİŞ-nə polis nəfəri kimi işə götürüldü. O vaxtdan da Qarabağ uğrunda gedən döyüşlərdə iştirak etməyə başladı. Yüzlərlə ər igidlər kimi doğma Tərtərinə düşmən ayağının dəyməsinə yol vermədi. «Vətən anadır, ana isə qorunmalıdır, çünki müqəddəsdir!» – inamı onun həyat amalına çevrilmişdi.

1993-cü il aprel ayının 5-də Ağdərənin Talış kəndi uğrunda gedən döyüşlərdə yaralandı, mina partlayışından ağır xəsarət aldı…

Hazırda II qrup Qarabağ Müharibəsi əlilidir.

Tərtər şəhərində yaşayır.





# Könüllü döyüşçü

Əli Səccər oğlu Həsənov 1956-cı il mart ayının 5-də Tərtər rayonunun Əksipara kəndində anadan olub. 1971-ci ildə həmin kəndin səkkizillik məktəbini, 1973-ci ildə isə Bakı şəhərinin Nərimanov rayonunda peşə məktəbini bitirib, kinomexanik sənətinə yiyələnib.

1975-1977-ci illərdə Sovet Ordusu sıralarında, Almaniya Demokratik Respublikasında xidmət edib.

1990-cı ildən müharibə qurtaranadək könüllü olaraq «Tərtər» Özünümüdafiə Batalyonunun tərkibində döyüşlərdə iştirak edib.

Ailəlidir, dörd övladı var.

Hazırda Tərtər rayonunun Əksipara kəndində yaşayır və Gəncə şəhərində işləyir.



## Şücaətli oğul

Mayıl Zakir oğlu İsmayılov 1972-ci ildə Tərtər şəhərində anadan olub. 1979-cu ildən Tərtər şəhər 2 saylı orta məktəbinin 8-ci sinfini, 1990-cı ildə 96 saylı Texniki Peşə Məktəbini bitirib, qaynaqçı peşəsinə yiyələnib.

Qarabağ Müharibəsi başlayanda Sovet Ordusu sıralarını tərk edərək könüllü surətdə döyüşlərə qatılıb.

1992-ci ildə «Tərtər» Batalyonunun tərkibində Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak edib. Həmin ilin avqust ayının axırlarında Drambon kəndi uğrunda aparılan vuruşmalarda ağır yaralanıb, üç ay Mərkəzi Hərbi Qospitalda müalicə olunub. Böyük qardaşı Əlinin müharibə zamanı itkin düşdüyünü eşidərək müalicəsini yarımçıq qoyub cəbhəyə qayıdıb. Onun Vəng uğrunda gedən döyüşlərdə şəhid olduğunu öyrənib. Qardaşı ilə birgə şəhid olmuş 13 nəfərin meyitlərinin döyüş zonasından çıxarılmasına nail olub.

Ailəlidir, bir qızı var.

Hazırda Tərtər şəhərində yaşayır.





## Laçınlı Namaz

Namaz Fərəc oğlu Rzayev 1965-ci il mart ayının 16-da Laçın rayonunun Qovşuq kəndində anadan olmuşdur. Uşaqlığı və gəncliyinin ilk illəri dağlar qoynunda, Azərbaycanın dilbər guşəsi Laçında keçib.

1983-cü ildə orta məktəbi bitirib. 1984-1986-cı illərdə hərbi xidmətdə olub. Sonra doğma kəndinə dönərək təsərrüfat briqadiri işləyib. Laçın erməni təcavüzkarları tərəfindən işğal edilərkən Tərtər rayonunun Sarıcalı kəndinə köçüblər.

1992-ci ildə Namaz Qarabağ uğrunda gedən döyüşlərə qatılmışdır. Dostları ilə birgə Tərtər və Ağdam ərazilərində erməni quldurlarına qarşı gərgin savaş aparmışdır. Ağdərə, Madagiz, Çaylı, Sərsəng, Vəng uğrunda gedən vuruşmalarda iştirak etmişdir.

Vəng istiqamətindəki döyüşlərdə başından ağır yaralanmış, ancaq sonradan yenə də cəbhəyə qayıtmışdır.

Namaz Rzayev hazırda Tərtər rayonunun Sarıcalı kəndində məskunlaşmışdır.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, üç övladı var.



# Vətənə gərəkli övlad

Hüseyn Böyükağa oğlu Nağıyev 1965-ci il oktyabr ayının 15-də Ağdərə rayonunun Umudlu kəndində dünyaya göz açmışdır. Uşaqlığı Umudlu kəndinin qoynunda, «Rus bulağı»nın ətrafında keçmişdi. Kəndinin təmiz havası, sıx meşələri ona ən saf duyğular aşılamışdı. Sonra hərbi xidmətə yollanmış, əsgəri borcunu Qazaxıstanda yerinə yetirmişdi.

Hüseyn Nağıyev Gəncə Baza İnşaat Texnikumunu bitirib.

1989-cu ildən Qarabağ Müharibəsinə qatılmışdı. Əvvəlcə «Umudlu» müdafiə batalyonunda, 1992-ci ildən isə «Fosfor-23» kəşfiyyat qrupunda döyüşmüşdü. Vuruşmaların birində ağır qəlpə yarası almışdı.

II qrup Qarabağ Müharibəsi əlilidir

Vətənə gərəkli 3 övlad böyüdür.

Hazırda Tərtər şəhərinin Qafur Məmmədov küçəsində yaşayır.





# Cəsarətli Cəsarət

Cəsarət Əsgər oğlu Şərifov 1970-ci il avqust ayının 3-də Ağdərə rayonunun Umudlu kəndində anadan olmuşdur. 1987-ci ildə həmin kəndin orta məktəbini bitirmişdir.

1988-1990-cı illərdə hərbi xidmətdə olmuşdur.

Hərbi xidmətdən geri qayıdanda Cəsarət öz vətənini od içində gördü. Kəndlərinə hər gün ermənilər hücum edirdilər. Qeyrətli və cəsarətli igidlərin hamısı cəbhədə vuruşurdu. O könüllü olaraq «Fosfor-23» kəşfiyyat qurupuna daxil oldu. Ağır və çətin döyüşlərdə iştirak etdi. Aşağı Vəng, Zəylik, Haterk, «Most», «Turbaza» əməliyyatlarında kəşfiyyatçı kimi şücaət göstərdi.

1992-ci il avqust 19-da «Turbaza» ətrafında gedən vuruşmalarda ağır yaralandı. Onu və onunla bərabər 6 nəfər döyüş dostunu vertalyotla Bakıya apardılar. Travmatologiya İnstitutunun Cərrahiyyə Şöbəsində müalicə olundu. Lakin səhhəti ona döyüşləri davam etdirməsinə imkan vermədi.

Cəsarət II qrup Qarabağ Müharibəst əlilidir.

Ailəlidir, bir övladı var.



# Mükafata layiq Vətən oğlu

Oqtay Muxtar oğlu Mehdiyev 1968-ci il fevral ayının 7-də Tərtər rayonunun Hacıqərvənd kəndində anadan olmuşdur .

1986-1988-ci illərdə sovet ordusunun tərkibində hərbi xidmət keçmişdir. 1991-ci ildə könüllü olaraq «Tərtər» Özünümüdafiə Batalyonuna yazılmış və Ağdərə istiqamətində gedən döyüşlərdə cəsarətlə iştirak etmişdir.

Ali təhsillidir, Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutunu bitirmişdir.

1992-ci il iyun ayının 6-da Ağdərənin azad olunması uğrunda gedən şiddətli vuruşmalarda yaralanmış, II qrup əlil olmuşdu. Buna baxmayaraq yenidən döyüşə qayıtmışdı. Ağdam, Kəlbəcər və Zəngilan rayonlarının işğalçılardan təmizlənməsi üçün aparılan döyüş əməliyyatlarında qorxmaz bir əsgər kimi özünü tanıtmışdı.

Zəngilan döyüşlərində silahdaşı Şamaxılı Lütvəliylə birlikdə 6 nəfər erməni quldurunu əsir götürmüş və buna görə də mükafata layiq görülmüşdü.

Ailəlidir, hal-hazırda Bakı şəhərində yaşayır.





# Yaxşı kəşfiyyatçı

Ceyhun Zakir oğlu Bayramov 1973-cü il iyun ayının 15-də Tərtərdə doğulmuşdur. Şəhər 2 saylı orta məktəbini bitirdikdən sonra təhsilini Azərbaycan Xalq Təsərrüfatı İnstitutunda davam etdirmişdir.

1991-ci ildə könüllü olaraq Qarabağ uğrunda gedən savaşlara qoşulmuşdu. «Tərtər» Özünümüdafiə Batalyonunda Azərbaycanın Milli Qəhrəmanı Vəzir Orucovla birlikdə Ağdərədən Vəngə qədər bütün ağır döyüşlərdə iştirak etmiş, kəşfiyyat dəstəsində ən mühüm tapşırıqları yerinə yetirmişdir. Göstərdiyi şücaətə görə dəfələrlə komandanlıq tərəfindən qiymətli hədiyyələr və təşəkkürlər almışdır. .

1994-cü il may ayının 6-da Ağdərə uğrunda gedən döyüşlərdə başından və sağ əlindən ağır yaralanmışdır.

İndi II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, bir övladı var.

Döyüş dostları onu indi də yaxşı kəşfiyyatçı kimi xatırlayırlar.



# Vətənə bağlılıq

Rəhim Kərim oğlu Sultanov 1962-ci ildə Tərtər şəhərində anadan olmuşdur .

1 saylı orta məktəbi bitirmişdir.

1981-1983-cü illərdə ordu sıralarında qulluq etmişdir. Hərbi xidmətdən sonra Rəhim Ukraynada işləmiş, bir neçə il vətəndən ayrı düşmüşdü. Ancaq uzaqda olsa da, ürəyi vətənlə bir döyünürdü.

Qarabağ Müharibəsi yüzlərlə Tərtər oğlu kimi onu da narahat etmiş, 1992-ci ildə doğma yurda dönmüşdü. Həmin ildən də müxtəlif bölgələrdə vuruşmuşdu.

1993-cü ildən isə rəsmi olaraq «Tərtər» batalyonuna yazılmışdı. «Platina əməliyyatı»nda, Çardaxlı, Akopkamari, Papravənd, Canyataq uğrunda gedən döyüşlərdə fəal iştirak etmişdi.

1993-cü il mart ayının 20-də Canyataq ətrafındakı vuruşmada ağır yaralanmış və ordudan tərxis olunmuşdu.

Rəhim Sultanov 1993-cü ildən II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, iki övladı var.





# Sənanın keçdiyi şərəfli yol

Sənan Əli oğlu Qayıbov 1962–ci ildə Tərtər şəhərində dünyaya göz açıb.

Orta təhsilini 1979-cu ildə şəhər 2 saylı orta məktəbdə almışdır. Sonra elektromexanika zavodunda fəhlə işləmişdir.

1980-ci ildə Azərbaycan Texnologiya İnstitutuna daxil olmuş, 1985-ci ildə oranı bitirmişdir. Sonra hərbi xidmətə getmiş, özünün dediyi kimi, «kişilik məktəbi» keçmişdir.

1991-ci ildə könüllü olaraq Qarabağ savaşına qatılmışdı. Hərbi xidmətdə öyrəndikləri təcavüzkarlara qarşı vuruşlarda ona çox kömək etmişdi.

Sənan baş leytenant kimi Ağdərə istiqamətində gedən döyüşlərdə fəal iştirak etmişdir.

1992-ci ildə həmin vuruşmaların birində baş-boyun hissəsindən ağır yaralanmış və Moskva şəhərində cərrahiyyə əməliyyatı keçirmişdir.

Sənan II qrup Qarabağ Müharibəsi əlilidir.

Xoşbəxt ailəsi var. Həyat yoldaşı Sevinclə iki övlad böyüdür. Qızı Fidan VI sinifdə, oğlu Davud isə III sinifdə oxuyur.



# Bütün varlığıyla döyüşürdü

Umudvar Məyiş oğlu Məmmədov 1971-ci il mart ayının 22-də Tərtər rayonunun Bayandur kəndində anadan olub.

Atası Məyiş kişi 1941-1945-ci illərin Böyük Vətən Müharibəsi iştirakçısı olub.

Umudvar həmişə atasının müharibədən danışdığı xatirələrə diqqətlə qulaq asar və özünü xəyalən hadisələrin içərisində hiss edərdi. O vaxt heç ağlına da gəlməzdi ki, 1988-ci ildə Xoruzlu kənd orta məktəbini bitirib, birbaşa hərbi xidmətə– ön cəbhəyə gedəcək, atası kimi o da müharibənin od alovunu görəcək, qanqadanın, ölümün şahidi olacaq, vətən adlı bir ananın yolunda bütün varlığıyla döyüşəcək və… 1992-ci ildə 21 yaşında III qrup Qarabağ Müharibəsi əlili olacaq.





# Düşmənlərin qənimi

Eldəniz İsmayıl oğlu İbadov 1955-ci il aprel ayının 27-də Tərtər şəhərində anadan olmuşdur.

1962-ci ildə Tərtər şəhər 3 saylı səkkizillik məktəbinin 1-ci sinfinə daxil olmuş, 1973-cü ildə Tərtər rayonunun Evoğlu kənd orta məktəbini bitirmişdir. Elə həmin il də keçmiş Ç. İldırım adına Politexnik institutuna daxil olmuşdur. 1979-cu ildə isə keçmiş S. M. Kirov adına ADU-nin fizika fakultəsinə daxil olaraq oranı 1984-cü ildə müvəffəqiyyətlə bitirib, təyinatla keçmiş Hidrometroloji Proseslərə Fəal Təsir Üzrə Hərbiləşdirilmiş Xidmət İdarəsinə göndərilmiş və orada muhəndis kimi iş fəaliyyətinə başlamışdır. Elə həmin il keçmiş Mardakert rayonuna uzunmüddətli xidməti ezamiyyətə göndərilmişdir. Ermənilərlə yola getmədiyinə görə 1986-cı ildə onu Fizuli rayonuna göndərmişlər. 1987-ci ildə Fizuli Hərbiləşdirilmiş Dəstənin baş mühəndisi və Operativ Fəal Təsir qrupunun rəhbəri təyin olunmuşdur.

1988-ci ilin may ayının 19-da toplardan və raket qurğularından istifadə edərək dolu buludlarını dağıdarkən guya o, Hadrut və Martuni rayonlarının kəndlərini atəşə məruz qoydu-

ğuna görə (doğrudan da, kəndlərin bir neçəsinə mərmi düşmüşdü, bunu isə ermənilər özləri qəsdən etmişdilər) keçmiş Dağlıq Qarabağın mərkəzi olan Stepanakert şəhərində Vilayət Təhlükəsizlik Komitəsinin işçiləri onu həbs etmək istəmişdilər. Füzuli rayonunun təhlükəsizlik orqanının vətənpərvər oğlanları Eldənizi aradan çıxartmışdılar.

1988-ci ilin payızında Şamaxı rayonunun Hərbiləşdirilmiş Fəal Təsir Dəstəsinə işə göndərilmiş, 1991-ci ilin oktyabr ayında məcburən sövq olunduğumuz müharibədə iştirak etmək üçün Qarabağa qayıtmışdı.

O vaxtlar Qarabağ və ətraf rayonlarda SSRİ qoşunları fövqəladə vəziyyətə nəzarət edirdilər. Azərbaycanlılardan adi ov tüfənglərini də yığmışdılar. Ermənilərlə bizim rayonlar və kəndlər arasında nəzarət məntəqələri qurulmuşdu. Ancaq bizimkilər əliyalın, yaxud sınıq-salxaq tüfənglərlə məntəqələrdə dururdular. O vaxt Şamaxıda, Şəkidə, İsmayıllıda, Akstafada və bir neçə digər rayonlarda toplar və «Alazan» qurğuları vardı. Eldənizin təklifi və iştirakı ilə həmin toplardan 8 ədədi Tərtərə gətirildi. Onları cəbhə boyunca düzdülər. Hələ topları heç kim idarə edə bilmirdi. Eldəniz çətinliklə olsa da bir neçə topçu öyrədə bildi. Bunların arasında Ədalət Paşayev, Vahid Fərəcov, Fizuli («Culu»), Elxan Alxanov, Etibar Abdullayev, Rəfail İbadov, Mobil Əliyev kimi cəsur oğlanlar vardı.

Eldəniz Ağdam rayonunun Şelli kəndində, «19-cu post» deyilən Qarağacı kəndində («Ala Yaqub»un dəstəsi), Papravənd kəndində, Şotlanlı kəndində və bir neçə yerlərdə topların yerləşdirilməsini, istifadə olunmasını təşkil etmişdi.

O, 1992-ci ilin fevral ayında Tərtər rayon ərazi özünümüdafiə batalyonunda artilleriya üzrə komandir müavini təyin olundu. 1992-ci il avqust ayının 28-də ağır qəlpə yarası aldı…

Eldəniz İbadov hal-hazırda Tərtər şəhərində yaşayır və Ekologiya və Təbii Sərvətlər Nazirliyi Milli Hidrometrologiya Departamenti Qarabağ Regional Hidrometrologiya Müəssisəsinin direktoru vəzifəsində işləyir.






# İki qardaş

Ağalar və İlqar qardaşdırlar. Ağalar 1965-ci ildə anadan olub, İlqar isə ondan 3 il sonra. Hər ikisi Tərtər rayonunun Söylən kəndində dünyaya gəliblər.

Torpaqlarımıza erməni yağıları hücum edəndə yüzlərlə vətən oğlu kimi onlar da könüllü olaraq cəbhəyə yola düşdülər. Hər iki qardaş Ağdərə və Ağdam istiqamətində gedən ağır döyüşlərdə fəal iştirak etmişlər. Vaqauz, Koçaqod, «Qozlu körpü», Haterk, Umudlu, Sərsəng, Çardaxlı, Madagiz, Ortakənd, Lüləsaz, Malakanlar, Həsənqaya kəndlərinin, Ağdam istiqamətində «Qlobus», Papravənd, Qalayçılar, Güllücə, Qırmızıkənd, Şotlanlı, Seyidsulan ərazilərinin uğrunda gedən döyüşlərdə şücaət göstəriblər.

İlqar Bayram oğlu Həsənovun sonuncu döyüşü 1993-cü il dekabr ayının 28-də Madagiz kəndi uğrunda oldr. Həmin gün qəhrəmanlıqla şəhid olan İlqar Tərtər rayonunun Söylən kənd qəbristanlığında uyuyur.

Ağalar isə hazırda Tərtərin Söylən kəndində yaşayır.

Ailəlidir, üç övladı var.



# «İndi də vuruşmağa hazıram»

Cahid Cəlal oğlu Allahverdiyev 1942-ci il noyabr ayının 14-də Bərdə rayonunda anadan olmuşdur.

1947-ci ildə Tərtər rayonunun Evoğlu kəndinə köçmüşlər.

Cahid Allahverdiyev gündüzlər fəhlə işləmiş, gecələr isə fəhlə-gənclər məktəbində təhsilini davam etdirmişdir.

1963-cü ildə əsgərlik borcunu yerinə yetirmək üçün hərbi xidmətə getmişdir.

1964-cü ildən 1992-ci ilə qədər baş mühasib işləmişdir.

1992-ci ilin aprel ayından başlayaraq Ağdərə istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Tərtərin igid oğulları Əli Qasımov, Rəfael Səmədov, Fizuli İsmayılov, Elman Rüstəmov, Səməd Xudaverdiyev, Gülağa Məmmədov, Ədalət Paşayev, Mahir Səfərov, Qüdrət Ağamalıyev, Rövşən Allahverdiyev, Rahilə Orucova və başqaları ilə birgə cəbhədə igidliklər göstərmişdir. Ağdərənin Aşağı Çaylı, Yuxarı Çaylı, Həsənqaya, Madaqiz, Ortakənd, Seysulan, Qırmızıkənd, Laçının Kürd Hacılı, Əlikli, Şamkənd, Pirlan, Qızılca, Ardıclı, kəndləri uğrundakı döyüşlərdə yaxından iştirak etmişdir. Çox vaxt yaralıları öz şəxsi «Jiquli» maşınında



xəstəxanaya daşımışdır. Nisbətən yaşlı olan bu döyüşçüdən gənclər çox şey öyrənmişlər – çətinliyə dözüm, möhkəm iradə, səbr, təmkin, hadisələrə soyuqqanlılıqla yanaşmaq.

Cahid Ağdərə və Laçın istiqamətlərində gedən vuruşlarda əvvəlcə topçu, sonra kəşfiyyatçı kimi döyüşmüşdür.

III qrup Qarabağ müharibəsi əlilidir. Ancaq vətən əmr etsə, 65 yaşlı Cahid yenə də döyüşə getməyə hazırdır.



# Vətən uğrunda əlil olub

Niyazi Hüseyn oğlu Axundov 1974-cü ildə Tərtər rayonunun İsmayılbəyli kəndində anadan olmuşdur.

1991-ci ildə orta məktəbi bitirmişdir. 1992-ci ildə hərbi xidmətə çağırılmışdır.

1993-ci ilin mart ayında Ağdərə uğrunda gedən döyüşlərə qatılmışdır. Elə həmin ildə də «Turbaza» istiqamətində gedən vuruşmalarda ağır yaralanmışdır.

Hal-hazırda II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, iki övladı var.





# Doğma torpağa böyük məhəbbət

Salman Yunis oğlu Axundov 1968-ci il fevral ayının 16-da Tərtər rayonunun İsmayılbəyli kəndində anadan olmuşdur.

Uşaqlığı doğma kəndlərində keçmişdir.

1986-cı ildə 96 saylı Texniki Peşə Məktəbini bitirmiş, 1987-1989-cu illərdə İrkutsk şəhərində hərbi xidmətdə olmuşdur.

1993-cü ilin fevral ayında iki qardaşı ilə birlikdə könüllü olaraq cəbhəyə yazılmış və Ağdərə uğrunda gedən döyüşlərdə iştirak etmişdir. Həmin ilin mart ayının 22-də «Qlobus» ətrafında gedən vuruşmalarda ağır yaralanmışdır.

II qrup Qarabağ Müharibəsi əlilidir.

Salman hazırda Tərtər rayonunun İsmayılbəyli kəndində yaşayır. Ailəlidir, Rəhimə adlı qızı, Əziz adlı oğlu var.

Salman Axundovun döyüş yolu qısa olsa da, Vətənə məhəbbəti böyükdür. Onu yaşadan da bu sevgidir.



# Kəndin könüllü müdafiəçisi

Rövşən Rəşid oğlu Ərəbov 5 aprel 1966-cı ildə Ağdərə rayonunun Umudlu kəndində anadan olmuşdur.

1983-cü ildə Umudlu kənd orta məktəbini bitirəndən sonra Şuşa Kənd Təsərrüfatı Texnikumuna daxil olmuşdur.

1985-1987-ci illərdə ordu sıralarında qulluq etmişdir. Hərbi xidmətdən sonra Rövşən Ərəbov yenidən texnikumda təhsilini davam etdirmişdir.

1988-ci ildə təyinatını öz doğma kəndinə almışdır.

Qarabağ hadisələri başladığı ilk gündən ermənilərə qarşı savaşa qalxmış, 1991-ci ildə könüllülərdən ibarət dəstəyə qoşulmuş, gündüzlər işləmiş, gecələr isə kəndin müdafiəsində durmuşdur.

1992-ci ilin qışında yaralanaraq Gəncə şəhərində qospitalda müalicə olunmuşdur.

Rövşən Ərəbov 1994-cü ildən Bərdə rayonunda Qarabağ Müharibəsi Əlilləri Cəmiyyətində şöbə müdiri, 1996-cı ildən isə həmin cəmiyyətin sədri işləmişdir. Sonra «Odlar Yurdu» Universitetinə daxil olmuş və 2001-ci ildə oranı bitirmişdir.

Qarabağ Müharibəsi əlilidir.





# Mərd sinədən yaralanar

Hikmət Həmid oğlu Abbasov 1959-cu il avqustun 2-də Tərtər şəhərində anadan olmuşdur.

1976-cı ildə Tətər şəhər 1 saylı orta məktəbi bitirən Hikmət 1978-1980-ci illərdə ordu sıralarında xidmət etmişdir. Xidmətdən sonra 12 il fərdi əməklə məşğul olmuşdur.

1992–ci ildə digər vətən oğulları kimi Qarabağ savaşına qatılmışdır. Ağdərə istiqamətində, Marağa, Marquşevan, «Torpaqtəpə», Həsənqaya, Çaylı və Madagiz uğrunda gedən döyüşlərin iştirakçısı olmuşdur. Elə həmin döyüşlərin birində – Madagizdə döş qəfəsindən yaralanmışdır. 1993-cü ildə İran İslam Respublikasında cərrahiyyə əməliyyatı olunmuşdur.

Hikmət II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, Fərid adlı oğlu, Fərizə adlı qızı var.

Hazırda Tərtər şəhərində yaşayır.



# Qarabağ uğrunda vuruşmuşdur

Mehman Raqub oğlu İsmayılov 1964-cü il oktyabr ayının 1-də Tərtər rayonunun Sarıcalı kəndində anadan olmuşdur.

1981-ci ildə Buruc kənd orta məktəbini bitirmiş, sonra hərbi xidmətə getmişdir.

Mehman 4 il sürücü işləmişdir. 1992-ci ildə isə torpaqlarımız uğrunda gedən vuruşlara qatılmış, Ağdərə bölgəsindəki müharibədə iştirak etmişdir. O, dəfələrlə yaralanmış, ancaq Vətən sevgisini hər şeydən üstün tutmuş, yolundan geri dönməmişdir.

1993-cü il iyun ayının 26-da ağır yaralandıqdan sonra Bakı, Moskva, Odessa səhərlərində müalicə olunmuşdur.

1994-cü ilin iyun ayında (atəşkəsdən sonra) mülki həyata qayıtmışdır.

O, II qrup Qarabağ Müharibəsi əlilidir.

Ailəlidir, 2 oğlu var.





# Adı əbədiləşdirilmişdir

İlham Mirzə oğlu Həsənov 1971-ci il aprel ayının 16-da Tərtər şəhərində anadan olub. Şəhər 2 saylı orta məktəbi bitirəndən sonra Rusiyada hərbi xidmət keçib.

Ermənilər torpaqlarımıza təcavüz edəndə qardaşı Teyyubla birgə könüllü olaraq cəbhəyə gedib.

Teyyub 1956-cı ildə anadan olmuşdur. Yaşda İlhamdan böyük olduğu üçün ona döyüşlərdə də kömək, arxa durub. İlham sanki Teyyubdan güc alıb. Hər iki qardaş müharibədə mərdliklə vuruşublar.

Ağdərə, Çıldıran və Vəng uğrunda gedən döyüşlər indi də İlhamın gözləri önündədir. Bu ağır günlərdə neçə dostunu, cəbhədaşını itirib. Qardaşı Teyyubun ölümü isə ona ən ağır zərbə olub. Düz 2 ay Teyyubun və onun 13 nəfər əsgər yoldaşının cəsədini qarın altından çıxara bilmədilər. Sonda yenə də İlhamın köməkliyi ilə qardaşının və o biri döyüşçü yoldaşlarının cəsədini götürə bildilər.

Qardaşı şəhid olandan sonra İlhamın düşmənə qəzəbi və kini daha da artdı. Dəfələrlə yaralansa da geri dönmədi. Yağılara qan uddurdu. Yalnız atəşkəsdən sonra silahını yerə qoydu.

İlham hazırda ailəlidir. Pünhan adlı oğlu, Aytac adlı qızı var.

Qardaşı Teyyubun ciyərparaları Ceyhun və Yunisi də öz balalarından ayırmır.

Teyyubun adı rayon uşaq xəstəxanasına verilməklə əbədiləşdirilmişdir.





# Mükafat almış döyüşçü

Mahir Rəsul oğlu Qarayev Ağdərə rayonunun Qərvənd kəndində anadan olmuşdur. 1983–cü ildə həmin kənddə orta məktəbi bitirmişdir. 1984–cü ildə hərbi xidmətə çağrılmışdır. Mahir əsgəri borcunu Almaniyada yerinə yetirmişdir. Sonra bir müddət kəndlərində sürücü işləmişdir. 1991–ci ildə ermənilər tərəfindən yaşadığı doğma kəndi təcavüzə məruz qaldıqdan – yandırıldıqdan sonra Kəlbəcər rayonunun Ağdaban kəndində yerləşən özünümüdafiə batalyonuna üzv yazılmışdır. Kəlbəcər rayonunun polis işçiləri ilə birgə özünümüdafiə batalyonunun tərkibində Çapar, Haterk əməliyyatlarında fəal iştirak etmişdir. Çapar uğrunda gedən döyüşlərdə şücaət göstərdiyinə görə mükafata layiq görülmüşdür.

Mahir 1994-cü ildə Ağdərə Rayon Polis Şöbəsinə işə qəbul olunmuş, həmin vaxtdan da Ağdərə istiqamətində gedən bütün döyüşlərdə yaxından iştirak etmişdir. O, «III sovxoz» ərazisində gedən şiddətli vuruşmaları birində ağır yaralanmış, uzun müddət Gəncə Şəhər Hərbi Hospitalında, sonra isə Daxili İşlər Na-

zirliyinin hospitalında müalicə olunmuşdur.

1998 – ci ilin yanvar ayında II qrup Qarabağ Müharibəsi əlili kimi təqaüdə çıxmışdır.

Ailəlidir, Samirə, Şahnaz, Nüranə adlı qızları, Vüqar adlı oğlu var.

Hazırda ailəsilə birgə Tərtər rayonunun Hüləbətli kəndində məcburi köçkün kimi məskunlaşmışdır.





# 13 qəlpə

Məzahir Zirəddin oğlu Süleymanov 1968-ci ildə Tərtər şəhərində anadan olmuşdur. Orta təhsilini Cəmilli kənd məktəbində almışdır. Orta təhsilini başa vurduqdan sonra – 1988-ci ildə hərbi xidmətə çağrılmışdır.

Erməni terrorçuları torpaqlarımızı işğal edəndə Məzahir də könüllü olaraq döyüşlərə qatılmış və bir çox vuruşmalarda iştirak etmişdir.

Ağdərə uğrunda gedən müharibə zamanı mina partlayışı nəticəsində ayağından yaralanmışdır. İkinci dəfə isə Ağdamın İlxıçılar kəndinin müdafiəsinə kömək aparan zaman ağır yaralanmış, əvvəl Ağcabədi hərbi qospitalında, sonra Bakıdakı Semaşko xəstəxanasında müalicə olunmuşdur. Bundan sonra ordudan tərxis edilmişdir.

Hazırda bədənində 13 qəlpə gəzdirir. Hər dəqiqə müharibənin ağrı-acısını duyur.

Məzahir Süleymanov Tərtər şəhərinin Ədalət Paşayev küçəsində yaşayır.

Ailəlidir. Tural adlı oğlu, Aygün adlı qızı var.



# Mehraca layiq qardaş

Cavanşir Məhəmməd oğlu Mahmudov 1962-ci ilin bir payız günü—15 oktyabrda anadan olmuşdur. 1979-cu ildə Səhlabad kənd orta məktəbini bitirmiş, 1981-ci ildə hərbi xidmətə yola düşmüşdür. 1983-cü ildə xidmətini başa vuraraq kəndlərinə dönmüşdür. Bir qədər təsərrüfatda çalışdıqdan sonra 1986-cı ildə o vaxtkı S. Ağamalı oğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna daxil olmuş, 1991-ci ildə oranı bitirmişdir.

Cavanşir qardaşı, igid döyüşçü Mehracı özünə həmişə ideal bilərdi. Elə buna görə də Qarabağ uğrunda gedən göyüşlərə Mehracla birlikdə qatılmışdı.

Cavanşir də 1993-1994-cü illərdə qardaşı ilə çiyin-çiyinə torpaqlarımızın azadlığı uğrunda döyüşmüş, Mehraca layiqli qardaş olmuş, qorxmaz döyüşçü kimi özünü tanıtmışdır.

Cavanşir Mahmudov 1995-ci ildən 2007-ci ilədək Tərtər Rayon Torpaq Şöbəsində yerquruluşu mühəndisi işləmişdir. Hal-hazırda Daşınmaz Əmlakın Dövlət Reyestri Xidmətinin Bərdə Ərazi İdarəsinin Tərtər Rayon Şöbəsinin müdiri vəzifəsində çalışır.

Ailəlidir. Aysel, Səbinə, Vüsalə adlı 3 qızı var.





# «Vətən mənə oğul desə…»

Nəsimi Bəhmən oğlu Yusibov 16 may 1974-cü ildə Tərtər rayonunun Səhlabad kəndində anadan olub. 1980-cı ildə Səhlabad kənd orta məktəbinin I sinfinə gedib. 1991-ci ildə orta məktəbi bitirib. 19.09.1992-ci ildə hərbi xidmətə çağırılıb. İlk xidməti borcunu təlim bazasında keçib. 17.02.1993-cü ildən cəbhənin ən ağır bölgəsinə—Ağdərəyə göndərilib. İlk döyüşə «Turbaza» istiqamətində başlayıb. Sonralar Azərbaycanın Milli Qəhrəmanı Vəzir Orucovla birlikdə Ağdam rayonunun Qalayçılar, Paprəvənd, Buəhmədli, Güllücə kəndləri uğrunda gedən döyüşlərdə iştirak edib. Ailəlidir, 2 oğul atasıdır. Təqaüdçüdür.

**Nəsiminin dediklərindən:** «Atalar misalıdır: «Ürəkdə olanda, biləkdə də olur».

06 yanvar 1994-cü ildə Lüləsaz kəndi yaxınlığında düşmənlə həlledici döyüşə girmişdik. 100 nəfərə qədər müqavimət dəstəmizə ermənilər qəflətən güclü hücuma keçdilər. 5 ədəd ağır texnika aramsız atəşlə bizim bölüklərimizi parçaladı. Vətən oğullarımız düşmənin texniki qüvvəsini dəf etməkdə çətinlik çəkirdilər. Dəstələr arasında əlaqə, demək olar ki, qırılmışdı. Döyüş-

çülərimizi bir ümidsizlik bürümüşdü. Geriyə isə yol yox idi. Səngəri tərk etmək ölümə bərabərdi. Öndə gələn düşmən tankı ilə ara məsafəm 30-35 metr olardı. Ayağa durdum. Axırıncı mərmini düşmənin «T-72» tankına tuşladım. Güclü atəşdən qulaqlarım tutuldu. Tank daha irəliləmirdi. İkinci «PDM»-i sumqayıtlı Kərəm vurdu. Onların irəliyə yolu bağlı idi. Ermənilərin ekipajından bir nəfər yaralı halda ora-bura vurnuxurdu və qaçmağa yol tapmadığından əlindəki qumbara ilə özünü partlatdı. Digəri isə salamat tankı qoyub qaçdı.

Mən boynumda dəhşətli ağrı hiss edirdim. Deyəsən, yaralanmışdım. Lakin döyüş ağrımı unutdurmuşdu. Mənə mərmi çatdırdılar, 2-ci atəşi də açdım. Düşmən geri çəkilmişdi…

O vaxt da, indi də qulaqlarımda Məmməd Arazın bu məşhur misraları səslənir:

«Vətən mənə oğul desə nə dərdim?
Mamır olub qayasında bitərdim».





# «Fosfor-23»ün fəal üzvü

***Hər qalamız, hər yuvamız bir ulusun yurd yeridi,***
***Qayalar aslan yatağı, mağaralar qurd yeridi.***
***İqlimlərdən-iqlimlərə hökm elədi yüz ərimiz,***
***Onun biri Qarqar idi, özgə biri Tərtərimiz.***

Elmar İnqilab oğlu Qasımov 12 noyabr 1976-cı ildə Ağdərə rayonunun Umudlu kəndində müəllim ailəsində anadan olmuşdur. 1984-cü ildə Umudlu kənd orta məktəbinin I sinfinə getmişdir…

Ancaq mənfur düşmənlərin təcavüzü bir çoxları kimi Elmarın da təhsilini tamamlamağa imkan vermədi. Gənc yaşlarından doğma kəndin müdafiəsinə qalxmaq onun üçün həm çətin, həm də şərəfli bir iş oldu.

1992-ci il fevral ayının 28-də Xocalı faciəsindən 2 gün sonra, kənd özünümüdafiə dəstəsinin üzvləri artıq müqavimətin yersiz olduğunu görüb kəndi tərk etməyə məcbur oldular.

Lakin bu ağrılı günlərdə silahlarını yerə qoymadılar. «Tərtər» batalyonunun tərkibində bu torpağın, dağın-daşın hər cığırına bələd olanlar yenidən mübarizə meydanına atıldılar. Yüzlərlə belə gənclərdən biri də Elmar idi.

**Elmarın dediklərindən:** «Kəndimizin itkisi ağır idi. Hər kəsdə belə inam var idi ki, bu hal 2-3 günlükdür. Mübarizə aparmaq əzmi ahılından cavanınadək hamının qəlbinə hakim kəsilmişdi. «Tərtər» batalyonunun rəhbərliyi tərəfindən umudlulara döyüşlərdə bələdçilik etmək üçün müraciət olundu. 16 avqust 1992-ci ildə 23 nəfərdən ibarət «Fosfor-23» əməliyyat qrupu yaradıldı. Qrupa təcrübəli, yol-izə yaxşı bələd olan baş leytenant Məcid Axundov komandirlik edirdi. Bu məqsədlə «Ural» markalı maşın da ayrılmışdı. Qrupun vəzifəsi döyüşən hissələri keçilməz dağ yolları ilə Tərtər-Kəlbəcər istiqamətində mümkün qədər təhlükəsiz və qısa yolla döyüş nöqtələrinə çıxarmaq idi.

«Kəlbəcər» batalyonu artıq qarşı istiqamətdən hücuma keçmişdi. Elmarın atası İnqilab müəllim qrupun üzvü idi. Hamı təkidlə Elmara yaşının az olduğuna görə arxa cəbhədə qalmağı məsləhət görürdü. Amma kəndə qayıtmaq hissi, qocaman atasından ayrılmamaq, düşmənə heç olmasa gücü çatan qədər zərbə vurmaq amalı onu fikrindən döndərmədi. Onu ön cəbhəyə aparan avtobusdan düşürə bilmədilər. «Fosfor-23» kəşfiyyat qrupunun ən kiçik kəşfiyyatçısı 16 yaşlı Elmar idi.

Əməliyyat uğurla keçdi.

Qarabağ Müharibəsi tarixində avqust 1992-ci il—Ağdərə əməliyyatı düşmənə vurulan sarsıdıcı zərbələrlə yadda qaldı. Əsgərlərimiz qədim Qanzasar monastırına qədər müvəffəqiyyətli döyüş əməliyyatı apardılar. Xankəndinə Şamxasur, Ayad adlandırılan iki kənd məsafəsi qalırdı. Düşmən ağır itkilər verərək geri çəkilirdi. Onların əlacı dağ cığırlarına minalar basdırıb, bizimkiləri ləngitmək idi. Qrup öz vəzifə borcunu yerinə yetirmişdi…

23 sentyabr 1992-ci il tarixdə Umudlu kəndində qərargahın yaxınlığında ermənilərin qoyduğu mina Elmarı öz döyüş yoldaşlarından ayırdı. Güclü partlayışdan sonra həyatını alt-üst edən ağır vəziyyət yarandı.

İndi əlildir. Amma hələ də başa düşə bilmir ki, bizimkilər Vəngdən niyə qayıtdılar.?!





# Vətənin fəxr edəcəyi oğul

Fəxri Lətif oğlu Lətifov 1975-ci il fevral ayının 20-də Laçın rayonunun Qarabəyli kəndində anadan olub. 8-ci sinfi bitirdikdən sonra, təhsilini Laçın şəhər 127 saylı peşə məktəbində davam etdirib. 1992-ci ildən məlum hadisələrlə əlaqədar təhsilini yarımçıq qoyub, vətənin müdafiəsi uğrunda döyüşlərə qoşulub. Azyaşlı olmasına baxmayaraq, könüllü şəkildə Laçın rayonunun Sarıbaba, Ərdəşəvi, Təzəkənd kəndləri uğrunda gedən döyüşlərdə iştirak edib. Laçının süqutundan sonra Tərtər rayonunun sərhəd kəndi olan Həsənqayada məskunlaşıb. Hərbi hissənin tərkibində Talış, Çaylı, Maralyan, Çardaxlı, Ulu Qarabəy, Sərsəng uğrunda gedən döyüşlərdə fəal iştirak edib.

Ağdam rayonunun İlxıçı, Güllücə, Paprəvənd, Buəhmədli kəndlərinin müdafiəçisi olub. Mehrac, Salam kimi igid döyüşçülərlə birgə vuruşub. Ailəlidir, 2 övladı var…

**Fəxrinin dediklərindən:** «Vətən itkisi acıdır… Düşmənə nifrətdən qıvrılıram. Amma təsəllimi onda tapıram ki, mən, heç olmasa, ermənilərə türk oğlunun kim olduğunu göstərə bilmişəm. Ən uğurlu döyüşümüz 1993-cü il dekabr ayının 27-də olub. Həmin gün bir hücumda düşmənin 6 tankını, 1 ədəd «PDM»-ni məhv etmişdik.

Xatırladığım sevindirici anlardan biri də Ağdərə rayonunun Göyarx kəndinin alınmasındakı hücum əməliyyatı zamanı olub. Bizim əks-hücumumuz düşməni təşvişə saldı. Səngəri tərk edib qaçan ermənilər əl qumbarasından girişdə tələ qurmuşdular. Mən tələyə düşdüm. Ayağıma ilişmiş əl qumbarası diyirlənib qarşıma düşdü. Sayıqlığımı itirmədim. Qumbaranı öz sahiblərinə tərəf atdım…

Ağdam rayonunun Salahlı, Kəngərli kəndlərində bizimlə üzbəüz səngərdə ermənilərlə ağır müharibə gedirdi. Əlimdəki «PK» pulemyotum hədəfdən yayınmırdı. Ermənilər müqavimətin yersiz olduğunu görüb geri çəkiləndə, özümdən asılı olmayaraq, səngərdən çıxdım. Ayaq üstə qaçan mənfurlara babat bir dərs verdim…

Bilirəm ki, əsl döyüş hələ qabaqdadır. Mən bu son döyüşü öz oğlanlarıma saxlamaq istəmirəm».





# Öncə Vətəndir

Teymur Bəhmən oğlu Yusibov 1972-ci ildə Tərtər rayonunun Səhlabad kəndində anadan olmuşdur. 1979-cu ildə Səhlabad kənd orta məktəbinin I sinfinə qədəm qoymuş, «Ana», «Vətən» kəlmələrinin şirinliyini dadmışdı.

Oxuduqca Vətəninin tarixini öyrənmiş, yurddaşlarının zaman-zaman başlarına gətirilən müsibətlər, parçalanan Vətənin, dağıdılan məmləkətinin dərdi onun qəlbində bir nisgilə çevrilmişdi.

Orta təhsilini başa vuran Teymur hərbi xidmətə yola düşmüşdür. 1992-ci ildə əsgəri borcunu yerinə yetirdikdən sonra Goranboy rayonunun Aşağı Ağcakənd polis batalyonuna işə qəbul edilmişdi. Elə o vaxtdan Vətənini erməni işğalçılarından qorumaq üçün döyüşlərə atılmışdı, Ağdərə, Fizuli uğrunda gedən vuruşmalarda fəal iştirak etmişdi.

Döyüş fəaliyyəti təkcə adları çəkilən rayonları deyil, Murov dağı və Kəlbəcər ərazilərini də əhatə etmişdir.

Teymur Yüsibov hal-hazırda Bakı şəhərində, Heydər Əliyev adına Neft Emalı zavodunun polis mühafizə dəstəsində polis baş serjantı rütbəsində çalışır.

Ailəlidir, Rəşad adlı oğlu və Səkinə adlı qızı var.



# «Əsgərlik kişilik məktəbidir»

Akif Fərman oğlu Abdulrəhimov 1968-ci il noyabrın 5-də Tərtərdə anadan olmuşdur. 1985-ci ildə orta məktəbi bitirmiş, 1986-cı ildə hərbi xidmətə getmişdir. Hərbi xidmət haqqında onun öz fikirləri var. Vətənin bütün oğullarına bu kişilik məktəbini keçməyi tövsiyə edir. Çünki hərbi xidmət gənclərə dözüm, dəyanət, çətinliyə sinə gərməyi aşılayır, vətəni ana qədər sevməyi, torpağın qədrini bilməyi öyrədir.

Akif 1988-ci ildə hərbi xidmətini başa vurub öz doğma yurduna dönmüşdür. Bu o vaxtlar idi ki, artıq məlum Qarabağ hadisələri təzə-təzə başlayırdı. Akifin doğulub boya-başa çatdığı Tərtər ermənilərlə həmsərhəd idi. Tərtərin bütün qeyrətli oğulları kimi Akif də könüllü olaraq «Tərtər» özünümüdafiə batalyonunun tərkibində Ağdərənin düşmənlərdən azad olunmasında fəal iştirak etmişdir.

Akif Abdulrəhimov hal-hazırda Tərtər rayonunun Səhlabad kəndində yaşayır, ailəlidir, beş övladı var.





# Tələbə döyüşçü

Faiq Yelmar oğlu Qurbanov 1969-cu il dekabr ayının 27-də Tərtər rayonunun Əskipara kəndində anadan olmuşdur. İbtidai təhsilini Əskipara kənd natamam orta məktəbində almış, orta təhsilini Qarağacı kənd orta məktəbində başa vurmuşdur.

1987-1988-ci illərdə hərbi komissarlığın göndərişilə Bərdə rayonunun 105 saylı texniki peşə məktəbində oxuyaraq sürücülük peşəsinə yiyələnmişdi. 1988-90-cı illərdə Sovet Ordusu sıralarında artilleriya sahəsi üzrə xidmət etmişdir.

1991-ci ildə Azərbaycan Kənd Təsərrüfatı Akademiyasına daxil olmuşdur. 1992-ci ilin iyun ayında akademiyada 30 nəfərdən ibarət könüllü dəstə yaradaraq, Tərtər rayonunda döyüşən «Qurtuluş» batalyonunun tərkibində Tərtər-Ağdərə istiqamətində gedən döyüşlərdə yaxından iştirak etmiş, bir sıra ərazilərin quldurların işğalından azad olunmasında gərgin döyüşlərin iştirakçısı olmuşdur.

Atəşkəsdən sonra təhsilini davam etdirmiş, 1996-cı ildə Akademiyanın torpaqşünaslıq fakültəsini bitirərək «yerquruluşu mühəndisi» ixtisasını almışdır.



# Uğurun uğurlu döyüşləri

Uğur Yelmar oğlu Qurbanov 1974-cü il dekabr ayının 17-də Tərtər rayonunun Əskipara kəndində anadan olmuşdur.

1992-ci ildə Qaradağlı kənd orta məktəbini bitirmişdir.

1993-cü il yanvar ayının 14-də Tərtər rayonunun Hərbi Komissarlığı tərəfindən həqiqi hərbi xidmətə çağrılmışdır. Həmin ilin yanvar ayının 14-dən başlayaraq bir neçə ay hərbi hazırlıq keçmişdir, sonra isə cəbhə xəttinə göndərilmişdir. Tərtər, Ağdərə və Ağdam istiqamətlərində gedən göyüşlərdə fəal iştirak etmişdir. Onun daxil olduğu batalyon düşmənin xeyli canlı qüvvəsini və döyüş texnikasını məhv etmiş, çoxlu sayda silah-sursatı qənimət kimi ələ keçirmişdir.

Döyüşlərin birində bu batalyonun döyüşçüləri ermənilərin 150-yə yaxın əsgərini məhv etmiş, 4 pulemyot, 65 avtomat, 6 qumbaraatan və 3 rabitə aparatı ələ keçirmişlər.

Qarabağ Müharibəsində Uğurun belə uğurlu döyüşləri az olmayıb. Akop Kamari və Papravənd istiqamətində gedən ağır vuruşmalarda Uğurgilin batalyonu qəhrəmanlıq göstərmiş və mükafata layiq görülmüşdür. Bu batalyon «Qlobus», Madagiz, Qa-



layçılar, Canyataq, Gülyataq, Çaylı və Orta kənd uğrunda gərgin döyüşlər aparmışdır.

Dəfələrlə o ölümlə üz-üzə gəlmiş, təsadüf nəticəsində sağ qalmışdır.

Məsələn, Uğurun da iştirak etdiyi bir döyüş əməliyyatında 2 nəfər qəhrəmancasına həlak olmuş, 7 nəfər yaralanmış, 2 nəfər kantuziya almışdır. Uğuru ölümün pəncəsindən yenə də bəxti qurtarmışdır.

Onların axırıncı döyüşü 1994-cü il yanvarın 27-də Akop Kamari istiqamətində gedən ağır döyüş oldu.

Bu vuruşmada ermənilər xeyli qüvvə itirərək geri çəkildilər. Onların 2 topu, 1 minaatanı və 1 döyüş texnikası qənimət kimi ələ keçirildi. Bu savaşda batalyon da az itki vermədi—5 nəfər həlak oldu, 9 nəfər yaralandı…

Uğur Qurbanov indi də yağı düşməndən qisas almağa hazırdır. Kifayətdir ki, ona: «Döyüş başlandı» – desinlər.



# Döyüşdüyü üçün fəxr edir

Novruz Savalan oğlu Əliyev Tərtər rayonunun Sarıcalı kəndində anadan olmuşdur. 1988-ci ildə Ələsgərli kənd orta məktəbini bitirmiş, 1989-1991-ci illərdə Kursk vilayətində hərbi xidmətdə olmuşdur. Əsgərlikdən sonra Tərtər rayon Polis Şöbəsində polis nəfəri kimi işə qəbul olunmuşdur.

1991-ci ildən Qarabağ döyüşlərində iştirak edib.

1992-ci ilin aprelində Marquşevan əməliyyatında döyüşərkən kantuziya almış, ayağından və qolundan yaralanmışdar. Müalicədən sonra yenidən cəbhəyə dönmüş, döyüş əməliyyatlarında iştirak etmişdir.

1993-cü ilin noyabr ayında Vəng uğrunda gedən döyüşlərdə yenidən kantuziya alaraq ayağından yaralanmışdır.

Səhhəti döyüşlərdə iştirak etməyə yol vermədiyi üçün ordudan tərxis olunmuşdur.

1998-ci ildən II qrup əlil kimi polis sıralarından da təqaüdə çıxmışdır.

Novruz ailəlidir, 3 övladı var.

Hazırda Tərtər rayonunun Sarıcalı kəndində yaşayır.

Vətən uğrunda döyüşdüyü üçün fəxr edir.





# Canını qurban verməyə hazırdır

Zabil Əlastan oğlu Məmmədov 1974-cü il avqust ayının 27-də Tərtər rayonunun Borsunlu kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra Tərtər Rayon Hərbi Komissarlığı tərəfindən xidmətə çağrılmışdır. İlk döyüş yolu Laçın rayonundan başlamışdır. Həmin vaxt ermənilər Laçının bütün kəndlərini və rayon mərkəzini tamamilə işğal etmişdilər. Zabilin daxil olduğu dəstə Kəlbəcərin Bəylik kəndindən başlayaraq Laçının Qorçu, Piricahan, Ərikli, Vaqazin, Sarıbaba və s. kəndlərini düşməndən azad etdi. Onlar hətta Laçın dəhlizinin yaxınlığına qədər irəlilədilər. Lakin o zaman hakimiyyəti idarə edənlərin səriştəsizliyi üzündən Kəlbəcər rayonu işğal olunan vaxt mühasirədə qalmamaq üçün onlar məcburiyyət qarşısında geri çəkildilər. Bundan sonra Zabil döyüş yolunu Tərtər-Ağdərə istiqamətində davam etdirdi.

1994-cü il mart ayının 18-də Zabilin daxil olduğu dəstə növbəti dəfə hücuma keçərkən o, piyada əleyhinə minaya düşdü və sağ ayağını dizdən yuxarı itirdi.

Zabil Məmmədov Vətəninin hər bir qarışının yağılardan azad olunması üçün qalan ömrünü də qurban verməyə hazırdır.



# Döyüşən qardaşlar

Ağayev Seymur Bərzi oğlu 1972-ci il iyul ayının 19-da Tər-tər rayonunun Əksipara kəndində anadan olmuşdur. 1986-cı ildə doğma kəndində səkkizinci sinfi bitirmiş və təhsilini 96 saylı Texniki Peşə məktəbində davam etdirmişdir.

1990-1992-ci illərdə Sovet ordusu sıralarında qulluq etmişdir.

1992-ci ilin mart ayından könüllü olaraq Tərtər özünümüdafiə batalyonunda çavuş kimi döyüş fəaliyyətinə başlamışdır. Cəbhənin Ağdam bölgəsinin Xoramurd, Şelli, Fərrux dağı və Ağdərə rayonunun Madagiz, Lüləsaz, Sərsəng Su Anbarı, Qozlu körpü, Çardaxlı, Vaqauz və s. kəndləri uğrunda gedən döyüşlərdə fəal iştirak etmiş, iki dəfə yaralanmışdır. Seymur Seysulan, Qırmızı kənd və Qapanlı kəndləri uğrunda gedən döyüşlərin də iştirakçısı olmuşdur. 1998-ci ildən leytenant kimi ehtiyatdadır.

Mehracın silahdaşı olan Fərhad da vətən uğrunda döyüşməyi özünə hər zaman şərəf bilmişdir. O, da qardaşı kimi Tərtər və Ağdamda gedən bir çox döyüşlərin iştirakçısı olmuşdur.





# Vətənin çağırışına səs verən oğul

Quliyev Teymur Süleyman oğlu 19 iyul 1973-cü ildə Tərtər rayonunun Qaradağlı kəndində kolxozçu ailəsində anadan olmuşdur.

1980-cı ildə Qaradağlı kənd orta məktəbinin I sinfinə getmişdir. 1988-ci ildə həmin məktəbin səkkizinci sinfini bitirdikdən sonra təhsilini 183 saylı Texniki Peşə məktəbində davam etdirmişdir.

1992-ci ildən Ağdərə bölgəsində hərbi xidmətdə olmuşdur və həmin ərazidə gedən son döyüşlərdə fəal iştirak etmişdir.

1992-ci ilin oktyabr ayında ordudan tərxis olunaraq əmək fəaliyyətinə başlamışdır. Hal-hazırda Tərtər Rayon DYMH-də baş yanğınsöndürən vəzifəsində çalışır.

Lakin Teymur hər zaman vətənin çağırışına səs verməyə hazırdır.

Ailəlidir, 3 övladı var.



# Ləyaqətli döyüşçü

Yusif Mikayıl oğlu Yusifov 1 avqust 1969-cu ildə Tərtər Rayonunun Səhlabad kəndində anadan olmuşdur. 1986-cı ildə Səhlabad kənd orta məktəbini bitirib ən gözəl arzularla həyatın qoynuna atılmışdı.

İki il—1988-ci ildən 1990-cı ilədək Sovet Ordusu sıralarında xidmət etmişdir.

O, ordudan tərxis olunanda artıq Azərbaycanda məlum hadisələr başlanmışdı.

1993-cü ildə Yusif Yusifov hərbiyə səfərbər edilmiş, Ağdərə rayonu və Kəmərli kəndi uğrunda gedən döyüşlərdə ləyaqətlə iştirak etmişdir.

Hal-hazırda Tərtər rayon Suvarma Sistemləri İdarəsində işləyir.

Ailəlidir. Ceyhun adlı bir oğlu var.





# Vətəndaşlıq borcu

Quliyev Yelmar Süleyman oğlu 9 iyul 1973-cü ildə Tərtər rayonunun Qaradağlı kəndində anadan olmuşdur. 1980-ci ildə Qaradağlı kənd orta məktəbinin I sinfinə getsə də, orta təhsilini 1988-ci ildə həmin kənddə yerləşən 183 saylı Texniki Peşə məktəbində bitirmişdir.

1992-ci il avqustun 22-də həqiqi hərbi xidmətə çağırılmışdır. 1993-cü ildən Tərtər rayonunda yerləşən hərbi hissədə qulluq etmiş, dəfələrlə döyüş əməliyyatlarında fəallıq göstərmişdir. 1994-cü ildə Ağdərə istiqamətində gedən döyüşdə yaralanmışdır. Gəncə hərbi qospitalında müalicə olunduqdan sonra təkrar ön cəbhəyə qayıtmışdır.

1996-cü il noyabrın 20-nə qədər öz vətəndaşlıq borcunu yerinə yetirərək vətənin keşiyində dayanmışdır.

Hal-hazırda Tərtər rayon Mühafizə Bölməsində polis nəfəri kimi fəaliyyət göstərir.

Ailəlidir, Tərtər şəhər N. Nərimanov küçəsində yaşayır.

# Vəhşilər

## *(poema)*



O yerlər könlümə yaman düşübdü!..
Hər kəndi bir qızıl binəydi, Allah!
Dönüb Xan Əminin şikəstəsinə
Dağ çayı yenidən dinəydi, Allah!

Bir igid bulaqdan qız qaçıraydı,
Fınxıran köhlənlər od qoparaydı.
Hürküb dağ kəlləri daş uçuraydı,
Kəkliklər gəvənə sinəydi, Allah!

Cənnət timsalıydı isti qucağı,
Güllərin ətrindən məstiydi dağı.
Bağrıma basaydım «Soyuq Bulağı»--
Alışan ciyərim sönəydi, Allah!

Düşəydim bir dəli eşqin izinə,
Aparaydı məni «Cıdır düzü»nə.
«Xarı bülbül»lərin şehli gözünə
Göyün ulduzları enəydi, Allah!

Üzümə dəyəydi  çiçək nəfəsi,
Məni uyudaydı bülbülün səsi.
Hər palıd ixtiyar dədə əvəzi,
Hər çinar bir nurlu nənəydi, Allah!

Laçını yenidən heyrət biləydim,
Kəlbəcəri qala—qeyrət biləydim.
Ağdamı yurduma şöhrət biləydim!..
Bu dövran tərsinə çönəydi, Allah!

Cəbrayıl sinəmi yandırıb yaxdı,
Qubadlı, Zəngilan sönmüş ocaqdı.
Füzuli gedəndə ildırım çaxdı—
Çaxan qəzəbiydi, tənəydi, Allah!

Yəqin qəribsəyib küsən yollarım,
Bənövşə yığınım, nərgiz kollarım…
Dağlara uzalı qalan qollarım
Şuşanın yoluna dönəydi, Allah!

Qarabağ! Dolanım başına sənin!
Qurbanam gözünün yaşına sənin!
Qan hopdu dağına, daşına sənin,
Başımıza gələn bu nəydi, Allah?!

***

İndi, qardaş, qan ağlayır
ağlar günə qalan Vətən!
Qarabağın həsrətindən,
ölənlərin, itənlərin harayından,
əsirlərin, girovların,
qaçqınların ah-vayından
gözləri dörd olan Vətən!
Şəhidlərin nisgilidir,
qubarıdır
dağlarını bürüyən çən.
Dərdimizin göyüm-göyüm
göynədiyi qabarıdır
Xocalıda yarasından
qan fışqıran yazıq Vətən!
«Hay deyəndə haya çatan»
hanı Qoç Koroğlun sənin?
Niyə belə nankor çıxdı,
niyə belə namərd oldu
öz döşündən süd verdiyin
oğlun sənin?!
Niyə, axı,
çəkib başa çıxardığın
övladların
bu torpağı, daşı deyil,



kürsüləri qucaqlayıb,
boğazları cırılınca
ekranlardan, efirlərdən,
qəzetlərdən bağırdılar?
Nəyə görə qəsdə durub
bu milləti haqqa deyil,
düşmən kimi
qırğınlara, ölümlərə,
zülümlərə
çağırdılar?!
O gün yenə
bığıburma, boynuyoğun
bir pəzəvəng
gurlayırdı mikrofondan
begemot tək.
«Od yağırdı» piy içində
itib-gedən gözlərindən.
«Qeyrət!», «Namus!»,
«Torpaq!», «Vətən!»…
sellənirdi sözlərindən.
Dəm vururdu igidlikdən,
məsləkini, amalını
ölümdən də uca tutan
qoçaqlardan.
Kərəm kimi, Məmməd kimi
qaçaqlardan.
Bu bişərəf nələr dedi,
daha nələr!..
Yəqin «tir-tir əsirdilər»
öz-özünün kölgəsindən
dovşan kimi qorxub qaçan
bu «nəhəng»in doğulduğu
ev-eşikdə tost deyərək
nəşələnən ermənilər.
Kəlmələrin qol-qıçını

sındıraraq tarixlərə
çox «baş vurdu».
Elə bil ki, danıışmadı—
ağzında it boğuşdurdu.
Çıxışının yekununa
çağırış kimi, şüar kimi
həyəcanlı nidaları
yapışdırdı:
«Allah qoysa, qisası da alacağıq!»,
«Allah qoysa, qələbə də çalacağıq!».
Pah atonnan!!!
Sən bundakı üzə bax bir!
Bu sifətin qarşısında
satıl, bülöv, çaylaq daşı
yumşaq şeydir.
Qozbel olan
bunun beli, kürəyi yox,
vicdanıdır, ürəyidir.
Bədbəxt oğlu
nə balıqdır, nə də ki, ət.
Əhsən sənə bu «kişi»də
sırtıqlığa, arsızlığa
tab gətirib,
cırılmayan belə sifət!
Elə bil ki, adam deyil,
düyünləri fır bağlayan
bir kötükdür—
xeyri yoxdur
ha çapılsın, ha yonulsun.
Yazıq alçaq
hara qədər alçalsın ki,
bunun kimi əclaf olsun,
alçaq olsun?!
«Allah qoysa…» – deyən namərd!
Namusunu yeyən namərd!



Bu sözləri deyə-deyə,
öz qınına çəkilmisən.
Vətən səni çağıranda
tülkü kimi
xəlvət yerə əkilmisən.
«Allah qoysa…»– deyən «kişi»,
məgər Allah qoymur səni
namusunu, qeyrətini qoruyasan?!
Məgər Allah qoymur səni
dədə-baba torpağına od vuranın,
boz külünü buludlara sovuranın
gözlərinə qor qoyasan?!
Məgər Allah qoymur səni
Soltan bəyin, Cavad xanın,
Qoç Nəbinin başdaşına söykənəsən?!
Məgər Allah qoymur səni
yağı düşmən gülləsindən
sinəsi od tutub yanan,
yıxılmağı ölüm sanan
qardaşına söykənəsən?!
Bir tıqqıltı eşidən tək,
bir qaraltı görən kimi
dabanına tüpürüb sən
hara belə əkilirsən?!
Səngərlərdə ər igidlər
yarasına buz basanda,
yuxubilməz, kiprikçalmaz
gözlərinə duz basanda,
sən işıqlı «Kafe»lərdə
tuluğuna nələr basdın?!
Öküz boyda cəmdəyini
büllur qədəhlərdən asdın.
Mənliyini, varlığını
konyak, şampan şüşəsindən süzə-süzə,
məşuqənin beş şahılıq şərəfinə

yağlı tərif düzə-düzə
xumarlandın, hallandın sən.
Namusunu, qeyrətini yeyə-yeyə,
ityalamaz yalaqlarda,
yallandın sən.
Bu dünyanın dar günündə,
xalqının ağlar günündə
hələ sənə hay çatmamış,
yüz qapını döyən vaydan
nəslinə bir pay çatmamış
hara belə, hara, axı?!
Səndən özgə, məndən özgə
kim qorusun bu torpağı?!
Belə zülüm görməyibdir
bu Yurd hələ!
Sən elə qaç, əsgər belə…
Tarix boyu
düşmənlərə qurban verdik
Azərbaycan torpağını
bilə-bilə, bölə-bölə.
Öz dədənin gorgahını qoyub qaçma!
Anaların, bacıların,
körpələrin, qocaların
min ahını qoyub qaçma!
Araz çayı yuya bilməz
günahını, qoyub qaçma!
Qaça-qaça Şuşa getdi,
Laçın getdi,
Murov getdi,
Xaçın getdi,
başın getdi,
qıçın getdi…
Daha nəyin qaldı sənin?!
Namusunu, qeyrətini
yağı düşmən öz xoşunla



öz əlindən aldı sənin!
Sonra bu yurdun başına
bu yurd boyda
bir qara daş saldı sənin!
Hansı dağı, hansı kəndi,
hansı yolu, hansı bəndi
erməniylə qabaq-qənşər
vuruşaraq, məğlub olub
verdik, axı!
Allaha da, bəndəyə də agahdır ki,
vəzifəyə, haram pula
qurban kəsdik bu torpağı!
Sənin kimi qeyrəti yox,
gözləri ac, cibləri tox
başımıza başçı olan,
bir əlində buxov, qandal,
bir əlində qamçı olan
başabəla «başbilənlər»
qan selinə atdı bizi.
Sonra keçi qiymətinə
satdı bizi.
Gözlərimiz görə-görə
qrupların, klanların,
qarətlərin, talanların;
gah arxadan, gah qarşıdan,
gah qurğuyla, gah qəsd ilə
güllələnmiş şəhidlərin
al qanları bahasına
harınlamış kalanların
hiyləsinə qurban getdik.
Min zülümlə,
min ölümlə
altı aya azad olmuş səngərləri,
Xankəndinə gedib çatan əsgərləri
beş-on dəyyus, qurumsağın

var üstündə, ad üstündə
boğuşması hesabına
üççə günə erməniyə təslim etdik.
Sonra isə…
Bu beş nəfər, bu on nəfər
Orden, medal, ad aldılar.
Çiyinlərə ulduz qondu,
yüksək-yüksək vəzifəyə
ucaldılar.
Sən ey Tanrı!
Sən ey Vətən!
Sən ey Torpaq!
Dəhşətə bax!!!
Bundan sonra
gedib kimə arxalansın,
gedib kimdən kömək umsun
bu məzlum xalq?!
Şahlarımız bu millətin əzabını
mərtəbələr arasında
pilləkana döndərdilər.
Bir qarın ac, bir qarın tox
ölmə-diril həyat sürən
bu ellərin təknəsinə
zəhər-zəqqum əndərdilər.
Biri gəlib taxta çıxdı…
Moskvanın tutuquşu balasıydı.
«Çal!»--desələr, öz xalqını
ilan kimi çalasıydı.
Və… çaldı da.
Elə bil ki,
qanımıza susamışdı,
kam alırdı faciədən,
göz yaşından…
Kam aldı da.
Dilimizdə nə danışdı bilinmədi.



Gen ağzında bir yumurta ilınmadi.
Bambılıydı zalım oğlu!
Bu Vətənin sinəsinə
çalın-çarpaz dağlar çəkdi.
Gah xalqına «hamam tikdi»,
gah «qoz əkdi».
Taxt-tacına qurban verdi
bu milləti.
Xainlərin caynağında
didiklənmiş
Azərbaycan tarixinə
onun qanlı əlləriylə
ağır-ağır silahlardan
od ələyən mərmilərlə,
ölüm saçan güllələrlə
pərçimləndi
***20 YANVAR FƏLAKƏTİ!***
Bu dəhşətin qucağında
Biri gəlib taxta çıxdı…
Bu torpağın faciəsi üzərindən
körpü salıb,
kürsüsünü qan üstündə qaldırdı o.
Bir zəhərli xəncər kimi
Xocalını vurub getdi
Azərbaycan torpağının sinəsinə.
Bir az dara düşən kimi
sələfi tək
götürüldü sarı, göygöz
«dədəsinin» binəsinə.
Xalqı darda qoyub qaçdı.
Bu torpağın altını da, üstünü də
yedi, yedi, doyub qaçdı.
Gəldi biri…
Söz verdi ki, üççə aya
titrədəcək göyü, yeri.

Heç keçmədi üçcə gün də
faş elədi nələr varmış
məqsədində.
Ətrafına qarğa, quzğun,
tülkü-mülkü toplaşdılar.
Leş üstünə daraşan tək
daraşdılar
məmləkətin bədəninə.
Didişdilər, boğuşdular,
ulaşdılar.
İtib getdi
hörmət, izzət, ölçü, mizan.
Gəlib yumşaq kürsülərdə
əyləşdilər
dünənəcən qarpız satan,
nəşə çəkən, «piyaniska»,
yoldan azan,
dədəsinə, nənəsinə quyu qazan.
Üzlərinə nə dedilər yapışmadı.
/Mən onlara otarmaqçün
Bir sürü qaz tapşırmazdım/.
Tapşırdılar bir ölkənin taleyini.
Zavallı xalq!
Dərk etmədin illər boyu
səndən sənə başçı olan
qurumsaqlar sürüsünün kələyini.
Əvvəl-əvvəl bu Vətənin
var-yoxunu taladılar,
doymadılar,
Fağırların az-çoxunu taladılar,doymadılar
Azərbaycan!
Nəyin vardı sata-sata
dağıtdılar,
yeyib-içib yata-yata dağıtdılar,
doymadılar.



Qızıl yükü daşıdılar,
yağ içində böyrək kimi
yaşadılar.
Ağız açdı ac mədələr.
Vaqon-vaqon, gəmi-gəmi
neft yedi,
ipək yedi,
kürü yedi,
pambıq yedi,
çaxır içdi,
çörək yedi
bu gədələr
doymadılar.
Sonra növbə sənə çatdı,
***ANA VƏTƏN, ANA TORPAQ!***
İnsandakı tamaha bax,
vicdana bax!
(***TORPAQ*** satan,***VƏTƏN*** satan
xainləri, satqınları öləndə də
bağışlamaz qara torpaq!).
Mərdimazar toxumu tək
səpildilər
bu millətin arasına.
Zəhər kimi töküldülər
adamların dərddən, qəmdən
qaysaqtutmaz yarasına.
İddiası Allahlığa gedib çatan,
içlərində tülkü yatan,
nə uçuğa suvaq olan,
nə yırtığa yamaq olan
yaramazlar.
Tamahı çox, ağlı azlar
kal armud tək tıxcandılar
boğazına bu millətin.
İt qanına döndərdilər

ruzisini məmləkətin.
Qardaş doğma qardaşına
düşmən oldu, güllə atdı.
Bu səngərdə ata yatdı,
o səngərdə oğul yatdı.
Manqurt kimi
buz bağlayıb dondu idrak,
dondu duyğu key başlarda
Azərbaycan ocaq-ocaq qaralırdı,
oymaq-oymaq dağılırdı,
oba-oba sökülürdü.
Yarasından qan sellənən
pələng kimi can verirdi
gah içindən onu didən,
gah çölündən onu yeyən
savaşlarda.
Dərdli Bakı çevrilmişdi
əclafların hiyləsindən,
riyasından don geyinmiş
siyasətin cəng yerinə.
Bu alçaqlar üzdə güldü,
arxadasa quyu qazdı
bir-birinə.
Gəncə oldu qanlı meydan!
«Oğul»-deyib, bəslədiyin
namərdlərin dırnağıyla
qəmli sinən dönə-dönə
parçalandı, Azərbaycan!
Qanlı qardaş qırğınına
bais olan canavarlar
sümürdülər yazıq  xalqın
al  qanını çanaq-çanaq.
Onlar üçün yüksək kürsü,
haram  dövlət,
hakimiyyət



hər şey idi,
bu millətsə bir oyuncaq.
İndi sizə nə deyim mən?
Zaman-zaman vurduğunuz yaraları
bu ellərə vurmayıbdır
heç bir düşmən.

Ciyərimin başı yandı!
Göz yaşlarım döndü selə!
Ürəyimi parçalayan kədərimi
o illərdə yazdım belə:

Çox əzab daşıyıb bu yurd, bu diyar,
Başdan zurna çalıb hərə bir cürə.
Xalqın taleyini tapşırıbdılar
Xalqın dərisini soyan kəslərə.

Pul meydan sulayıb,cövlan eyləyir,
Günahsız qanları pulla yuyurlar.
Hər kim nə istəsə yazır, söyləyir,
Buna da «Aşkarlıq» adı qoyurlar.

Vəzifə başında yenə oğrular,
Yenə də iş görür hiylə, fırıldaq.
Nə qədər ortada pul var – hesab var,
«Həmin dəyirmandı, həminki çax-çax».

Buxova salınıb ədalət, düzlük,
Qeyrətli ürəklər salamat qalmır.
Müdir kürsüsündə əyləşən «3»-lük
«10»-luğu, «100»-lüyü vecinə almır.

Buyryq qulu olan möhürlü «nər»lər
Qeyrəti, namusu ağır yük bilir.
Qəfəsə salınır pələnglər, şirlər,
Tülküyə, çaqqala meydan verilir.

Xalq suya möhtacdır, havaya möhtac,
Yalanlar doğrunu boğazdan asır.
Boğur kasıbları, boğur ehtiyac,
«Arxalı köpəklər yenə qurd basır».

Bu necə yaşayış, bu nə həyatdır?!
Yoxsulluq içində çırpınır bəşər.
Çəmən həmin çəmən, at həmin atdır,
Yalnız hörüyünü dəyişdiriblər.

Analar ümidi bükür sözünə
Qundaqda körpələr kiriyə bəlkə.
Ət, süd əvəzinə, yağ əvəzinə
Verilən vədləri yeyir bir ölkə.

Tükənib hər şeyin barı, bəhrəsi,
Bərəkəti qaçıb zəminin, çölün.
Alınıb dilindən haqq deyən səsi,
Beli yağır olub bu boyda elin.

Bu necə ölkədir, bu necə qanun?
Zülümdən, zillətdən niyə doymurlar?!
Allaha şükür ki, hələ kasıbın
Aldığı nəfəsə vergi qoymurlar!

Namərdlər baş olub başsız ölkəyə,
Hərrac bazarında Vətən torpağı.
Sonra da deyirlər: «Bu millət niyə
Dilənçi kökündə yaşayır, axı?».

Ağlayır Vətənin torpağı, daşı,
Gözümüz kor olub, görmürük, nədir?
Bizim «başbilənlər» sağlıqda «yaxşı»,
Öləndən sonrasa «xalq düşməni»dir.



Sapı özümüzdən baltalar iti,
Meşədə meşəlik qalmayıb daha.
İtirib namusu, yeyib qeyrəti,
Ümid bağlayırlar «Qadir Allah»a.

Qoşulub dartırıq nə yükləsələr,
Dillər qıfıllıdır, ayaq buxovlu.
Bürünüb «***YANVAR***»a çox dəhşət gələr,
Gələr bu millətin faciə yolu.

Şəhidlər «***AZADLIQ***» himnini çalar,
Oyanmaz qeyrətlər vuruş səsinə.
Mənim ürəyimi yarıb açsalar
Bənzər «Azərbaycan xəritəsi»nə

***

Belə-belə
haram əllər haram qatdı
aydan arı, sudan duru
bu torpağın halal, təmiz
çörəyinə, havasına.
Xalqın igid oğulları
cəbhələrdə qan tökəndə
par-par yanan salonlarda
çoxsifətli deputatlar
çıxmışdılar
var uğrunda, mal uğrunda,
mənsəb, şöhrət, yal uğrunda
yaxacırma davasına.
Sən bunların birisinə
bir vəzifə versən əgər
ayağını yalar, vallah!
Bir adamda neçə ürək,
neçə vicdan,

neçə namus,
neçə sifət
olar,Allah?!

***

Sifət təngə gəlmir, sifət yorulmur,
Tükənmir üzdəki süni boyaqlar.
Bunlara baxanda inanmaq olmur
Adamda bir ağız, iki dodaq var.

Çəkməz xalq dərdini, el xiffətini,
Gah yalan ağlayar, gah yalan gülər.
Beləsi bir anda öz sifətini
Kirli dəsmal kimi dəyişə bilər.

Qoyasan kürsüdən yağlı söz deyə,
Özündən «qəlbiyə» kənizdir, kəniz.
O qədər üzü var.. ikiüzlüyə
Min dəfə şükürlər etməliyik biz.

Gözü ayağının altını görməz
Yerindən bircə mıx yuxarı qalxsa.
Danışan kukladır, qurama bir səs,
Yazılıb- pozulan lentdirmi yoxsa?!

Çapan yarışında yer tutub öndə—
Bu gün yıxdığına sabah əl çalır.
Ona da, sənə də insan deyəndə
Adam öz gözündə enir, alçalır.

«Uzun ətəklər»ə əli çatmasa
Göylərdə Günəşi, Ayı danar o.
Yaltaqlıq etməyə adam tapmasa,
Evdə arvadına yaltaqlanar o.



Tora salmaq üçün fağır milləti
Sifətlər pərdədir, sifətlər bəlgə.
Faş olsa bunların məkri, xisləti
Şükürlər edərik düşmənə bəlkə?

Kürsüdə ilan tək qıvrılıb yatır,
Tamah tuluqları özləri boyda.
Elə bil sifət də törəyib artır—
Say yoxdur bunların üzləri sayda.

***

Namusunu itə atan,
qeyrətini, vicdanını
pula satan
«başbillənlər»;
Öz yurdunun çörəyinə
nankor baxıb, daş bilənlər;
Baş yerinə çiyinlərdə
balqabağı gəzdirənlər;
Dədəsinin, babasının gor evini,
öz kökünün, öz nəslinin sümüyünü
yağıların tapdağında
əzdirənlər;
Qızıl dolu,gümüş dolu
tabaqları
yeddi arxa dönəninin
tamahları bəs edincə
dörd yanına düzdürənlər;
Xarici pulxanalarda
dəftər-kitab açdıranlar;
Əsgərlikdən oğurlayıb
övladını vətənindən qaçdıranlar
bu torpağın tarixini qazmaq üçün
düşmənlərin əllərinə bel verdilər.
İllər boyu

ermənin hiyləsiylə
bu diyarda qan üyüdən
dəyirmana su tökdülər,
yel verdilər.
Əvvəl-əvvəl
daşnakların saman altdan
su yeridən fitvasıyla
İrəvandan Xankəndinə
fitnə, fəsad, kin selləndi.
Pusqu quran,quyu qazan
zinaların tələsindən
Sumqayıtın qucağına
qan çiləndi.
Bakı oldu qan dənizi.
Ayıltmadı bunlar bizi.
Bilmədik ki, Moskvada
Raisanın «saqqızını oğurlayıb».
Qarbaçovun qazanına
bu «mələyin» əlləriylə
briliyantlar doğrayıblar.
Ağanbekyan «Humanite»də
Qarabağın dünəninə, bu gününə
şər-şəmətə, böhtan atdı—
duru suya haram qatdı.
Biz lal olduq!
Lalayanlar,
Balayanlar
soyumuza, kökümüzə balta çaldı,
bir millətin tarixini
qıxmalayıb qamqalaq tək
«Ocaq» çatdı.
Biz kar olduq!
Namusları beh-bazarlı
Silva kimi arvadları
boynumuza kəmsik saldı.



Biz kor olduq!
Zəhərləri diş altında tuluq olan,
ermənin qulu olan
satılmışlar
Əfi ilan sürüsü tək
töküldülər üstümüzə,
biz tək qaldıq.
Yavaş-yavaş
silahlara əl atıldı.
Raket, mərmi uğuldadı,
tank dilləndi, top uladı…
Belə-belə, gündən-günə
Vətənimin torpağı da,
dənizi də,
ağacı da,
aranı da,
yaylağı da,
körpəsi də, qocası da
ermənin əllərilə güllələndi.
İndi isə…

Dərə dolu selləriynən
Qan-yaş tökür dağlar indi.
Əsir düşən çəmənlər də,
Çiçəklər də ağlar indi.

Bu, nə zülüm, bu, nə sitəm?!
Ürək—zədə, kədər—çitəm.
Olmalıykən iki didəm
Kor olub bulaqlar indi.

Nalə çəkir göyüm, yerim,
Çovğun olub dərdi—sərim.
Heşan olan qəbirlərim
Ürəyimi dağlar indi.

Bu torpaqda qor uyubdu,
Ərlər onu qoruyubdu.
Həsrət çəkib quruyubdu,
Yetim qalan bağlar indi.

Demə: «Babam Qorqud olub»,
Demə: «Atam Boz Qurd olub».
Ölənlərim qol-bud olub,
Nə gündədir sağlar indi?!

Hayımıza yoxdur bir hay,
«***VƏTƏN!***» – deyib, üzüldük day.
Tərtər, Zabux, Bərguşadçay
Gözlərimdən çağlar indi.

Didərginə yay da qışdır—
Bu, bir Allah qarğışıdır.
Xan Araza qan qarışdı—
Suyu matəm saxlar indi.

Hanı nər igidlər, hanı?!
Cəng bürüyə bu meydanı.
Cavanşiri, Səttarxanı
Gözləyir torpaqlar indi.

***

Elə bil ki,
indi bizdən perik düşüb
nəyimiz var.
İtib gedib müqəddəslik,
külə dönüb qeyrət, vüqar.
Varaqla sən tarixləri
varaq-varaq,
Hər günündən vay tökülən



aylara bax, illərə bax!
Ötən əsrin yarısından
üzü bəri
görün nələr törətməyib
bu erməni vəhşiləri?!
Görün necə zillət çəkib,
necə ağlar günlər görüb
Od Yurdunun nəsilləri!
O zaman da bu vəhşilər
odda qızmış süngülərlə
Nəcəf [1] kimi aşıqların,
neçə-neçə
ağsaqqalın, ağbirçəyin
xaç çəkilmiş çılpaq, üryan
kürəyinə
odlu, qaynar samovarı bağlayıblar.
Sinələri parçalayıb,
anaların bətnindəki
körpələri çıxararaq doğrayıblar.
Uşaq yaşlı gül qızların,
gözü yaşlı xanım-xatın gəlinlərin
ətürpədən naləsinə
qəh-qəh çəkib,
süzərək «Rus arağı»nı
başına bir qədəh çəkib,
namusunu, ismətini
əclaf kimi oğrayıblar
bu alçaqlar!
Azərbaycan övladını
«Türkdür!» – deyə,
diri-diri, tikə-tikə
parçalayıb,
sonra isə buğum-buğum, əza-əza
doğrayıblar.

[1] Aşıq Ələsgərin şəyirdi Daşkəndli Aşıq Nəcəf (1876-1918)

Sonra isə əzaları
qızıl pula satanlardı:
bu alçaqlar!
Özgəsinin dədə-baba torpağını
qan gölünə qərq eləyib,
bu qan üstə əqrəb kimi
yatanlardı bu alçaqlar!
Toy günündə «dığa»lara
gətirilən «harsın»ların
ayaqları altda yıxıb,
Yurdumuza dayaq olan,
başımıza papaq olan
igidlərin başlarını
qurbanlıq tək kəsənlərdi;
Girov düşən kişilərin
gözlərinin qarşısında
qadınların döşlərini
kəsənlərdi bu alçaqlar!
Meyidlərin dişlərini
sökənlərdi bu alçaqlar!
Şəhidlərin gözlərini
tökənlərdi bu alçaqlar!
Ta qədimdən bu günədək
doğma, ulu obamızın qucağına
qanımızı axıdaraq
ovuc-ovuc içənlərdi bu alçaqlar!
Əsirlərin bəbəyinə neştər soxub
çıxarmaqdan doymadılar!
Min əzabla, min dəhşətlə
qolu, qıçı sındırılmış,
qan içində çırpınaraq
qurban gedən ərənlərin
cəsədini təhqir edib,
burun, qulaq… qoymadılar.
Ürəkləri soyumadı sağlar ilə.
Meyidləri qalaqlayıb



od vurdular!
Beşiklərdə mışıl-mışıl
mürgüləyən
körpə-körpə uşaqları
süngülərə keçirdilər,
iri dəmir borularda,
qazanlarda qovurdular!
Neçə oğul-qızımızı
özlərinə qazdırılan xəndəklərdə
diri-diri basdırdılar.
Kişiləri xristian
xaçlarına mismarlayıb,
arvadları saçlarından
asdırdılar.
Qış küləyi
yalquzaq tək ulayanda
buzu qırıb, su altında
müsəlmanı dondurdular.
Körpələri, qocaları
məscidlərə, komalara
dolduraraq yandırdılar.
Neçə-neçə bataqlığın,
neçə-neçə quyuların
diblərində
cəlladların baltasıyla
qətlə yetən
qalaq-qalaq, yığın-yığın
soydaşımın sümüyü var.
Hansı yandan bu torpağı
adam boyu qazsan əgər
erməninin başımıza
gətirdiyi min-min dəhşət
üzə çıxar.
Yer altından su yerinə
qan fışqırar!

Ölənlərə toxunmayın!
Toxunsanız,
yaraların ağrısından
min-min cəsəd dilə gələr,
can qışqırar!
Xıncımlanmış, ovxalanmış
sümüklər də nalə çəkər!
Şəhidlər öz hallarını
görsə əgər,
diri ikən mil soxulmuş,
bıçaq deşmiş
gözlərindən alov tökər!
«Qisas!» – deyər meyidlər də!
«Qisas!» – deyər şəhidlər də!
«Qisas!» – deyər göy də, yer də!
Bizim üçün, tarix üçün
görk yaşayır qəbirlərdə.
Unutmayın, ey insanlar!
Unutmayın, müsəlmanlar!
Erməninin məkri ilə
zaman-zaman
Yer üzündə haqq boğulub,
şər qüvvələr baş qaldırıb,
oyanıbdır.
Zülüm Ərşə dayanıbdır!
Bu dünyaya gəlib onlar
goreşən tək
qan sümürə, gor dağıda,
qəbir eşə.
Vəhşilər də nifrət edər
hər addımı qan qoxuyan,
ölüm saçan bu vərdişə!
Vəhşi elə vəhşi olur…
Vay o günə
insan oğlu insanlıqdan



üz döndərib,
bunlar kimi vəhşiləşə!
İnanmışam erməninin törətdiyi
dağ götürməz, daş götürməz
dəhşətləri, zülümləri
gözlərimlə görən andan,
Allah hələ xəbərsizdir
yediyi qan,
içdiyi qan,
varlığı qan
bu millətin yer üzündə
varlığından!
Biz bələkdə körpələrə
süd qoxulu lay-lay deyib,
gül qoxulu bayatıyla
beşikləri bələyəndə;
məhəbbəti, sədaqəti,
təmizliyi, səxavəti
uşaqların ruhlarına çiləyəndə;
onlar bu vaxt şeytan,
xortdan,
cəllad,
qatil…
neçə-neçə xof doğuran
adlar tapıb,
«Türk» sözünə calayaraq
körpələri qorxudublar.
Bilə-bilə uşaqları
kin, küdurət, qisas, nifrət
zəhəriylə qoxudublar.
Biz, dərisi qalınlara,
mərifətdən, qanacaqdan
dışarıda qalanlara,
ürəkləri, beyinləri
yalınlara

«Qanmaz!» – dedik.
Onlar isə erməninin qanmazına
«Türk!» – deyərək bağırdılar.
Bizlər itin balasını
«İt küçüyü» çağıranda,
onlar qəsdən
«Türk balası» çağırdılar.
Elimizə, obamıza,
dədəmizə, babamıza
təhqir dolu, söyüş dolu
yağdırılan söz qalmadı.
Xərçəng oldu, vərəm oldu
kif bağlamış içlərində
Azərbaycan övladının daşıdığı
türk soyadı?
Yalanları, böhtanları
haqq üzükməz dillərinə yapışdırıb,
özlərinin törətdiyi
vəhşiliyi, qəddarlığı
adımıza yazıbdılar.
Dünən, bu gün
daş üstündə, mis üstündə
Yer üzünə canlı hələ
gəlməmişdən—
Adəmdən də, Həvvadan da
o tərəfə gedib çıxan
özlərinin tarixini qazıbdılar.
Nəhəng «Böyük Ermənistan»
dumanında azıbdılar.
Daş dövründə, tunc dövründə
guya yalnız onlar imiş
bu dünyanın sahibləri.
İnsanlarsa
bu günlərdə uzaq-uzaq
ulduzlardan gəlibdilər.



Sonra isə
torpaqları, ümmanları
erməninin qucağından zorla alıb
qitə-qitə, sərhəd-sərhəd
bölübdülər.
Həya bilməz, ardan uzaq
bu naxələf ermənilər
neçə kərə
millətlərə atdıqları
şər üstündə qırılıblar.
İnsan qanı sümürməyə həris olan
mığmığa tək
əziliblər, yox olublar.
Ancaq yenə bu əclaflar
çayır kimi yeri cırıb,
ordan-burdan dikəliblər.
Quyruq altda ömür sürən
gənə kimi
törəyiblər, çoxalıblar.
Bir az keçib…
Unutmuşuq başımıza gələnləri.
Unutmuşuq diriləri, ölənləri.
Unutmuşuq yerimizi, göyümüzü
şırımlayan,
ölüm yüklü buludlardan
şaqqıldayan ildırımı.
Unutmuşuq hər daşına
müsəlmanın qanı hopmuş,
erməninin əməlindən
yarğanlaşan
qanağızlı sıldırmı.
Unutqanlıq azarına tutulandan
başlanıbdır biz millətin
soyqırımı.
Unutmuşuq Şamaxının

qan selində batıb gedən,
yetmiş neçə il ötsə də
qanı hələ qurumayan daşlarını.
Unutmuşuq Bakı, Gəncə…
daha neçə
kənd, şəhərdə erməninin
doğradığı,
sonra isə küçələrdə qalaq-qalaq,
təpə kimi topladığı
müsəlmanın başlarını!
Unutmuşduq
ulumuzun uyuduğu gorgahı da.
Biz az qala
unutmuşduq Allahı da!
Qardaş, daha
bizim kimi bir millətə
Yaradanın dönə-dönə göstərdiyi
görkü bəsdir!
Bir ürəyi iki bölən
Araz adlı dərdimizin
üzərindən saldığımız,
sonra isə
əlimizlə kərpic-kərpic sökdüyümüz,
yağılara ərməğan tək verdiyimiz
körpü bəsdir!
Gavırların od vurduğu
Azərbaycan tarixinin
yandırılmış illərindən,
aylarından, günlərindən
qopub qalxan,
gözümüzü kor eləyən,
qəlbimizi pörşələyən
bürkü bəsdir!
Yer üzündən silmək üçün
diri-diri, tikə-tikə doğradılar



türkü, bəsdir!
Bəsdir daha ölkəmizin sərvətini
taladılar ətək-ətək!
Dinmədikcə qudurdular
babaları Dro, Mıştok,
Hamazasp tək, Andronik tək.
Burunları ovulmadı.
Bu vəhşilər öz vaxtında
dilbərüzlü yurdumuzdan
qovulmadı.
Caynaqları kəsilmədi.
Buna görə başımızın üzərindən
vay gətirən bayquş səsi
əksilmədi.
Müsəlmanın al qanını
ovuc-ovuc, çanaq-çanaq içdiyindən
«Tayqulaqlı Adronik»ə
dastan qoşub, heykəl yapıb,
bir əzəmət qalası tək,
«Xalqın əsil balası» tək
qəhrəmana döndərdilər.
Belə «Milli Qəhrəman»lar
neçə türkün ocağına
dərd əndərib, qəm calayıb,
söndürdülər.
Ha dad döydü biçarə xalq!
Harayına hay vermədi
bizdən olub erməniyə oxşayanlar—
yumşaq, rahat kürsülərdə
təkəş-təkəş oturanlar.
Hay vermədi
bu millətin dərisinə saman təpib,
şərəfinə toxunanlar.
Amma bunlar
bir erməni «dığa»sının

Yurdumuzun paytaxtına
dönüşünü eşidən tək
ayaqyalın, başıaçıq
yüyürərək
əllər üstə gətirdilər.
Nə istədi, nə buyurdu
həmin anda yetirdilər.
Mən bilmirəm niyə belə
biz tez əydik düşmənlərə
boyunduruq samısından
yağır olmuş minnət yüklü
boynumuzu?
Niyə, axı,
toyumuzdan əziz tutduq
«axçi»lərlə «kirvə-kirvə
oynumuzu»?
Niyə, axı,
bizim şahlar
harda yaxşı dağımız var,
harda güllü bağımız var,
harda doğma şəhərlər var,
harda nurlu səhərlər var,
harda ləziz bir tikə var,
harda «yağlı vəzifə» var…
erməniyə tapşırdılar?!
Onlar isə parazit tək
dərimizdən yapışdılar.
Ona görə
bu günlərə qaldı millət.
Ona görə
qismətimiz oldu bizim
zülüm, zillət.
Ona görə inləyirik
əclafların tapdağında.
Ona görə



nifrətini qazanmışıq
«Ana!» – deyə, hay-küy salıb,
guya candan sevdiyimiz,
son günlərdə beşdən biri
pay verilmiş
torpağın da!
Ona görə
öz yurdundan perik düşən
milyondan çox qaçqınımız,
köçkünümüz zülümdədir.
Ona görə
təkcə bizim atalar yox, analar yox,
cavanlar da, körpələr də
ağrısını, acısını dadıb bilir
ölüm nədir, zülüm nədir!
Ona görə
neçə ildir tamarzısı olduğumuz
göy meşələr, uca dağlar
qurban getdi!
Ona görə
dövrəsində kef məclisi qurduğumuz,
sonra isə namərd kimi
girov qoyub qaçdığımız
coşqun çaylar, gur bulaqlar
qurban getdi!

***

Həsrətindən göynədiyim
A dağ, qurbanın olaydım!
Dodağından öpəydim kaş,
Bulaq, qurbanın olaydım!

Arzularım selləneydi,
Çəmən-çiçək tellənəydi.
Uşaqlığım yellənəydi,
Budaq, qurbanın olaydım!

Sizdən ayrı neydir səsim,
Təngiyibdir gur nəfəsim.
Üşüyəndə əsim-əsim,
Yarpaq, qurbanın olaydım!

Nə müddətdir yol gözləyən,
Külə dönüb öləziyən,
Kösövündə dərd gizləyən,
Ocaq, qurbanın olaydım!

Ömrümüzdən qışdır keçən,
Ürəyimdə qışlayır çən.
Yollarında qış mələyən,
Yaylaq, qurbanın olaydım!

Yaramızdan sızılır qan,
Ağla, könlüm, sızılda, yan!
«***VƏTƏN!***»--deyib, sızıldayan,
Dodaq, qurbanın olaydım!

Yadırğayıb toy-düyünü,
Sinəsində qəm üyünür.
Səni qurban verən günü,
Torpaq, qurbanın olaydım!

***

Deyin, indi hardan alaq
Nuru kimi pələngqeyrət,
aslanürək bir paşanı?!
Türk eşqiylə, türk oduyla,
ürəyindən havalanan
milli qeyrət vulkanıyla
lərzə sala bu dünyanı!
Qan-qadaya yerikləyən
erməniyə tanıtdıra öz həddini.



Poladüzlü qılıncından iti olan
qəzəbiylə, nifrətiylə
qoruya göz bəbəyi tək
Osmanlının sərhəddini.
Yatdıqları qəbirlərə yalvaraqmı
sıyırsınlar xəncər kimi
Tələt bəyi, Cavad xanı?!
Bəlkə onlar
yarasına məlhəm qoya
it ağzında çeynənilən bu məkanın?!
Azərbaycan ellərini
ermənінin taunundan xilas edən
Abbasqulu bəy tək bəylər,
Pənahoğlu Məhərrəmlər,
Ələkbərlər,
Fətullah tək,
İbrahim tək,
ərlər hanı?
Ənvər Paşa, Camal Paşa
dağıdardı qan üstündə cövlan edən
bu dövranı.
Kəlbalı xan, Cəmşid ağa
bilsəydilər dərdimizi
gorgahların yaxasını cırardılar,
yerlərindən pələng kimi durardılar!
Yüz il öncə qurduqları
bir divan tək haqq divanı
qurardılar.
Elə bil ki,
yoxa çıxıb ər kişilər—
nakişilər kişidən çox.
Mərmərlənmiş divarların,
xalçalanmış otaqların,
meşinlənmiş qapıların
o üzündən bədbəxt xalqın

nalәsini eşidәn yox!
İllәr ötür…
Özümüzә gәlmirik biz.
İllәr ötür…
Xeyrimizlә şәrimizi
bilmirik biz.
İllәr ötür…
1905-ә qәdәr,
1905-dәn sonra
qara geyib günlәrimiz,
dağ çәkilib sinәmizә.
Bu zülümlәr, bu sitәmlәr
görk olmadı niyә bizә?!
1914 – vәhşәt!
1915 – dәhşәt!
1916-da,
1918-dә
ermәninin qan süzülәn caynağından
Әrzurumda, Әrdәhanda,
Bayburdda, Әrzincanda,
Qars elindә,
daha neçә türk yurdunda
nәlәr çәkdi yazıq millәt!
1920—haray!
Bir tәrәfdәn bolşeviklәr,
bir tәrәfdәn daşnakların
it sürüsü quduz kimi
bu torpağın ürәyinә
әkdilәr dәrd, sәpdilәr vay!
1937,
1948-dә,
1949-da
Dәrәlәyәz, Vedibasar,
Zәngibasar,
Göycә…kimi



neçә-neçә ata-baba mahalımız
viran oldu, yetim qaldı.
İrәvanın, Zәngәzurun
mavi, tәmiz göylәrini
Allah bilir, neçәnci yol
tüstü basdı, duman aldı.
Torpağımın dәrisini neçә yerdәn
para-para doğrayaraq
köşә kimi sırım kәsib sıyırdılar.
Başımıza qapaz salıb,
әlimizdәn aldıqları torpaqlarla
özümüzü özümüzdәn ayırdılar.
Xәncәr kimi
yurdumuzun ürәyinә soxuldular.
Müftә torpaq, saxta vәtәn
azarına yoluxdular.
Naxçıvan tәk doğma diyar
gözümüzdәn iraq duşdu.
Dilicandan, İçevandan,
daha neçә nur mәkandan
ayağımız qaçaq düşdü.
Sәn bir, qardaş,
xәritәyә diqqәtlә bax.
Gör bir necә
tikә-tikә doğranıbdı
beş il, on il bundan öncә
bütöv olan
bu ***ANA YURD, ANA TORPAQ!***
Şaumyanın, Mikoyanın,
daha neçә vәhşi «…yan»-ın
qara, çirkin niyyәtilә
binәva xalq baş götürüb
öz yurdundan, öz elindәn
qaçqın düşdü, köçkün düşdü—
bir obadan yüz obaya

dağıldılar.
Boz çöllərdə, meşələrdə,
ilanmələr güşələrdə yaşadılar.
Yeri qazıb, torpaq altda
yığıldılar—
ömr etdilər diri ikən
«qəbirlərdə».
Ümid yandı, külə döndü
səbirlər də.
Qiybət, yalan yağmurunda
dil-dil ötən dillərimiz
lal oldu, lal!
Yediyimiz, içdiyimiz dərdi-məlal.
Millət dərdi, Vətən eşqi
itib-batdı tamah adlı
bəlamızın kəsafətli quyusunda.
Xorna çəkdik
bağrı yanıb kösövlənmiş
bu torpağın üstündə yox,
gözümüzə pərdə tutan,
beynimizi iflic edən
boş vədlərin, xəyalların
uyğusunda.
Başımızın üzərində qıyya çəkən
raketlərin ölüm saçan nəfəsindən,
yeri, göyü silkələyən
tank səsindən, top səsindən
nə diksindik, nə ayıldıq.
Hələ bunlar azmış kimi
günahkar da biz sayıldıq.
Kafərlərin noxtalayıb, palanlayıb
mindikləri nəfsisıyıq ölkələrdə
yaradılmış üfunətli
camırlığa bulaşıbdır
dünənimin qan yaddaşı.



Neçə ildir
təzdən yenə tuğyan edir
əsrlərdən keçib gələn,
müsəlmanın varlığına
yönəldilmiş din savaşı.
Gəl, hardasan Nuru Paşa?!
Xəlil Paşa, Veysəl Paşa,
Qarabəkir, Mürsəl Paşa…
Niyə, axı çevrildiniz soyuq daşa?!
Gəlin, görün Azərbaycan
nə gündədir?!
Gəlin, gəlin, başa salın
namusunu pula satan alçaqlara
***TORPAQ*** nədir, ***VƏTƏN*** nədir!
Göycə yenə ağlar qaldı!..
Dədə Qorqud boylarından
baş götürüb, boy göstərib
buludları ətəkləyən
ulu-ulu dağlar qaldı!
Ölən öldü – can qurtardı,
diri ikən ürəkləri ölüb gedən
canlı deyil, bir gəzərgi ağrı olan
sağlar qaldı!
Topxanada bir ağacın
harayına dözməyən xalq
***XOCALININ***
Allahı da pörşələyən
naləsinə dözdü necə?!
Bu millətin taleyində
qeyrətsizlik, namussuzluq
damğası tək
«Axır-məhşər gün»ə kimi qalacaqdır
sızım-sızım sızıldayan
o bir gecə!!!
Qaysağını qoparım mən

üreyimdə göz-göz olub,
qövr eləyən
Laçınınmı, Şuşanınmı yarasını?!
Vəzifə, var tamahıyla
boğuşanlar sürüsünün qəsdi ilə
Ağdam qurban gedən zaman
qurban verdik
bu Vətənin ürəyinin parasını!
İllər boyu zülüm çəkib
kərpiç-kərpic tikdiyimiz
dam-daşımız yağmalandı.
Əlimizin qabarıyla yığdığımız
daş-qaşımız yağmalandı.
Qoynumuzda od qalandı.
Erməniyə Qarabağdan
neçə dəfə böyük olan
«Qarabağlar» bağışlandı.
Lənkəranda «Talış-Muğan Respublikası»
alqışlandı.
Gəncə oldu ayrı «xanlıq».
Qazaxdan ta Bakıyadək,
o tərəfdən
Zaqatala, Qax, Balakən,
bu tərəfdən
Ağcabədi, Bərdə, Tərtər—
hərəsi bir hökmranlıq!
Bu ölkəni basıb, əzdi
soyğunçuluq, qudurğanlıq!
Yaratdılar neçə banda,
neçə dəstə!..
Düşmənlərin əvəzinə töküldülər
bu biçarə xalqın üstə.
Adamları öz evindən perikdirib
var-yoxunu talamağa
fürsət güdən «öz ordumuz» – bu dəstələr



özümüzdə xof yaratdı.
Düşməndən çox öz əlimiz
özümüzü sökdü, satdı.
Pul artdıqca, tamah artdı.
Nəfs işlədi dərinlərin dərininə.
Silah satıb doymadılar,
başladılar erməniylə döyüşlərdə
şəhid olan igidlərin—meyidlərin
alverinə.
Haram pullar kisə-kisə çoxaldıqca
gözlər qızdı, əməl azdı.
Siz bir görün
tamah gəlib hara çıxdı?!—
arvadını, bacısını
pula satan bişərəflər
pul xətrinə
bir səngərdə döyüşdüyü,
bir dolçadan su içdiyi
yoldaşının kürəyinə güllə sıxdı!
Sonra isə…
Bu namussuz «dada çatdı» –
erməniyə neçə milyon
pul verərək alıb güya
itkin düşmüş övladının
cəsədini tapmaq üçün
qurban deyən
atalara, analara, oğul deyil,
kürəyindən güllələnmiş
meyid satdı.
Belə namərd bizdəndirsə
biz öləsi bir millətik!
Gərək daim qan-yaş axa gözümüzdən!
Düşmənlərlə bacarmağa nə var, axı?!
Sən, İlahi, bizi qoru özümüzdən!
Deyiblər ki,

Yaradanın səbri gendir—
gec-tezi var.
Harda olsa tutacaqdır
xainləri tökülən qan!
Biz nə hala saldıq səni,
necə yazıq günə qoyduq
Qoca Şərqin gündoğarı,
***AZƏRBAYCAN!***

***

Bu gün ömür bir qovğadır,
Dünya yaman qasırğadır.
Sevgimizə qadağadır
Tamahımız, Azərbaycan!

Bu, vuruş yox, badalaqdı,
Gözümüzdən bulaq axdı.
Gecəmiz yas, bədayaqdı
Sabahımız, Azərbaycan!

Tarixin qan yaddaşıdır—
Bu savaş din savaşıdır.
Girov qızın göz yaşıdır
Günahımız, Azərbaycan!

Düz qəddimiz dördqat olub,
Ölüm bizə nicat olub.
Məkrimizdən çat-çat olub
Gorgahımız, Azərbaycan!

Yağan qəmmi, yağışlarmı?
Bizi tutub qarğışlarmı?
Bu milləti bağışlarmı
Allahımız, Azərbaycan?!

***



Ürəyimin qəmlə silə hönkürtüsü
sızıldatdı məni belə.
Gah yandırdı, gah göynətdi,
gah ağlatdı məni belə!
Bilirəm ki,
hər gecənin nurla dolu
bir gündüzü,
hər dərdin bir əlacı var.
Bir gün gələr
şəhidlərin axan qanı
Vətənimin yaralanmış
ürəyinə məlhəm olar.
O Yurdda ki,
şəhid gedən oğullar var,
bütün dünya dağılsa da,
o Yurd yaşar!

****

Şəhidlik—ölümün həsəd zirvəsi,
Şərəfsiz ölümlər zülümdür, qardaş!
Şəhidlik—Allahın əzizlərinə
Qıydığı ən gözəl ölümdür, qardaş!

Şəhidlər ölümü şöhrətə salar,
Yüz il yaşasa da ər olmaz gədə.
Ölümün pisi də, yaxşısı da var—
Ölüb Koroğlu da, Keçəl Həmzə də.

İgid bir yol ölər, qorxaq min kərə,
Namərdlər tamaha satdı torpağı.
Ölüm də heyifdir qeyrətsizlərə—
Ölənlər torpaqdır—Vətəndir, axı!

Öluмə dağ çəkdi şəhid Nəsimi,
Babəkdən əcəl də düşdü qorxuya

Öləndə öləsən Beyrəklər kimi—
Ölümün düşmənə meydan oxuya!

Bu yurdda nə qədər alçaq, satqın var
Qurban gedəcəkdir igidlərimiz.
Başdan hökm edirsə Səhl-Sumbatlar
Elə qan gölündə üzəcəyik biz.

Şəhid var, deməli, ***ANA VƏTƏN*** var,
Şəhidlər – bu yurdun qılınc-qalxanı.
Şəhid var, deməli, sağaldacaqlar
Köksü parçalanmış Azərbaycanı!

***

Əsgər qardaş!
Görmürsənmi yollarını gözləməkdən
nə gündədir ana Torpaq?!
Gözünü sil ,
talan olmuş bu ellərə,
viran qalmuş könüllərə,
əsirlikdə zülüm çəkən
qocalara, uşaqlara,
qarılara, gəlinlərə
bir yaxşı bax!
Daha geri çəkilməyə yermi qalır?
Görmürsənmi yağı düşmən
Vətənində at oynadıb,
məskən salır?!
Yığ başına igidləri,
yağıların üzərinə
şahə qalxan dalğalar tək
qoşun-qoşun axın, gedin!
Göyü-yeri silkələyən
bir «Cəngi»nin qanadında
ildırım tək çaxın, gedin!



Bu dünyaya haray salsın
vuruş səsi!
Köksünüzdən qoy püskürsün
od yurdunun od nəğməsi
Daha belə yaşamağa dözüm yoxdur,
Sən də, mən də bilirik ki,
bizim seyrək cərgəmizdə
öz canının üstə əsən,
puldan ötrü, vardan ötrü
Vətənini qurban kəsən
alçaq çoxdur!

***

Bu cəng «Koroğlu cəngi»dir,
İgidlər el pələngidir.
Hər qaya bir üzəngidir,
Hər zirvə Çənlibel kimi.

Qəzəbiniz alovlansın,
Düşmən sizi alov sansın.
Sinənizdə alov yansın
Od puskürən bu el kimi.

Qarabağın yarası qan,
Dərd sellənir yarasından.
Ey ərənlər, gəlib zaman
Kükrəyin dəli sel kimi.

Sıldırımı mum eləyin,
Səngərləri şum eləyin.
Yağıları qum eləyin,
Çırpın daşlara yel kimi.

Yaralanmış aslan olun,
Yurdumuza qalxan olun.

Vətən—***AƏZRBAYCAN***
olun,
Dönün yumruğa əl kimi.

***

Yoxsa bu yurd
dərd içində
çırpınaraq
can verəcək.
Sonra onun
göyü, yeri,
oğlu, qızı
dəli kimi hönkürəcək.
Bir az keçsə
gec olacaq.
Bu vətənin torpaqları
illər boyu olduğu tək
düşmənlərə
əbədilik pay qalacaq!

Covğun dərdin əsərindən
Yarpaq kimi əsirəm mən.
Öz yurdundan əsirgənən
Qan nəyimə gərək mənim?

Dövrəmizi alıb duman,
Tıncıxmışıq zaman-zaman.
Üfüqündən kədər daman
Dan nəyimə gərək mənim?

Bu diyara hopub heyrət,
Torpaq-namus, torpaq—qeyrət,
Vətənsiz dünyacan şöhrət—
Şan nəyimə gərək mənim?



Sinəmdir dağlar çəkilən,
Gözümdən oddur tökülən.
Qürbətdə zərə bükülən
An nəyimə gərək mənim?

Bu dağları qibləgah san,
Öz elində ocaq ol, yan.
Vətənə qurban olmayan
Can nəyimə gərək mənim?

***

Parçalanmış ürəyinə
qurban olum ***AZƏRBAYCAN—***
***ANA VƏTƏN!***
Bir silkələn!
Qazan xanın qılıncını
dayaq elə!
Nəsiminin köynəyini
bayraq elə!
Mehdilərin, Həzilərin,
Gəraylərın, Vəzirlərin
qeyrətini çıraq elə!
Hər daşını, hər kolunu
yaraq elə!
Hər oğlunu, hər qızını
silaha sıx, patron elə,
daraq elə!
Məlik kimi qıpçaqların,
öz evindən qaçaqların,
boğosların, vartanların—
bu torpağın üzərində
ilan kimi yatanların
qəddini əy—oraq elə!
Boş-boşuna
«mənəm, mənəm!» – deyənlərin,

qeyrətini yeyənlərin
varlığını boz kül elə,
torpaq elə!
Bükülərək yerə gəlmiş
dizlərini düzəlt, dikəl!
Ey ***ULU YURD***, ey ***QOCA NƏR,***
özünə gəl!
Havalansın qoy sinəndən
igidlərin ***«VƏTƏN!»*** – deyən
od nərəsi!
Bu nərədən lərzə gəlsin,
səni hələ yazıq bilən,
səni hələ tanımayan
***YER KÜRƏSİ!!!***



# KİTABIN İÇİNDƏKİLƏR

Ön söz ............................................................ 3

## ŞƏHİDLİK XOŞBƏXTLİYİ

Əfsanəvi qəhrəman ............................................ 10
Əbədiyaşarlıq ................................................... 18
Mənalı ömür ...................................................... 20
Tərtərlilərin fəxri ............................................. 26
Vəzirin igid qardaşı Əliyar .................................30

## SIZLAYAN YARALAR

«Tərtər» batalyonunun yaradıcılarından biri .................. 33
Vətən sevgisi ....................................................35
Müqəddəs döyüş yolu .......................................... 37
Cəsarət və mərdlik nümunəsi ................................39
Xeyirxah insan ......... ......................................... 40
Adı kimi etibarlı oğul .......................................... 42
Mübariz döyüşçü ............................................... 43
Düşmənlə üz-üzə ................................................ 44
Ön cəbhədə vuruşmuşdur ..................................... 45
Əsgər olmaq arzusu ............................................46
Əsl vətəndaş ...................................................... 47
İkinci həyat ....................................................... 48
Ağır döyüşlərin iştirakçısı ..................................... 50
Qardaşlarını da əvəz etmişdir ................................ 51
Vətənə bağlı oğul ................................................ 53
Ata-oğul döyüş dostu olublar ................................54
Nağı öz vətənini qoruyurdu .................................... 55
İgid Vətən oğlu ................................................... 56
Qanun keşikçisi cəbhədə ...................................... 57
Müəllim döyüşçü ................................................ 58
Vətən qarşısında üzü ağdır .................................. 59

Həyat məktəbi ………………………………………………… 60
Ən böyük borc …………………………………………………... 61
Gərəkli insan …………………………………………………… 62
Qorxmazlıq ……………………………………………………… 63
Həyatla qovğa …………………………………………………... 64
Vəzirin silahdaşı ……………………………………………… 65
Alnıaçıqlıq ……………………………………………………… 66
Həcər qeyrətli qadınlarımız ……………………………………67
Böyük iradə sahibi ……………………………………………… 68
Cəbhə kişilik meydanıdır ……………………………………….69
Ən böyük arzu …………………………………………………...70
Döyüş dostlarından ayrılmaq istəmirdi ……………………….. 71
Onun həyat amalı ……………………………………………….72
Könüllü döyüşçü ………………………………………………73
Şücaətli oğul ……………………………………………………..74
Laçınlı Namaz ………………………………………………….. 75
Vətənə gərəkli övlad …………………………………………….. 76
Cəsarətli Cəsarət ……………………………………………….77
Mükafata layiq Vətən oğlu ……………………………………...78
Yaxşı kəşfiyyatçı ……………………………………………….79
Vətənə bağlılıq …………………………………………………... 80
Sənanın keçdiyi şərəfli yol …………………………………… 81
Bütün varlığıyla döyüşürdü ……………………………………... 82
Düşmənlərin qənimi …………………………………………….. 83
İki qardaş ………………………………………………………... 85
«İndi də vuruşmağa hazıram» ………………………………… 86
Vətən uğrunda əlil olub ………………………………………… 88
Doğma torpağa böyük məhəbbət ……………………………… 89
Kəndin könüllü müdafiəçisi …………………………………….. 90
Mərd sinədən yaralanar ………………………………………… 91
Qarabağ uğrunda vuruşmuşdur ……………………………….. 92
Adı əbədiləşdirilmişdir …………………………………………….. 93
Mükafat almüş döyüşçü ………………………………………… 95
13 qəlpə ………………………………………………………… 97
Mehraca layiq qardaş …………………………………………... 98



«Vətən mənə oğul desə…»……………………………………99
«Fosfor – 23»ün fəal üzvü …………………………………101
Vətənin fəxr edəcəyi oğul …………………………………….103
Öncə Vətəndir ………………………………………………….. 105
«Əsgərlik kişilik məktəbidir» ………………………………. 106
Tələbə döyüşçü …………………………………………….. 107
Uğurun uğurlu döyüşləri ……………………………………. 108
Döyüşdüyü üçün fəxr edir…………………………………… 110
Canını qurban verməyə hazırdır ……………………………. 111
Döyüşən qardaşlar ………………………………………….112
Vətənin çağırışına səs verən oğul …………………………….113
Ləyaqətli döyüşçü ………………………………………….. 114
Vətəndaşlıq borcu …………………………………………… 115

## POEMA

Vəhşilər ……………………………………………………… 117

